**Diyanət İşləri Başqanlığı Yayınları: 684**
**Uşaq kitabları: 176**

## Dualarımı öyrənirəm

**Koordinator**
Dr. Ömer MENEKŞE

**Müəllif**
Rabia GÜLCAN

**Rəsimleyən**
Dağıstan ÇETİNKAYA

**Tərcümə**
Nurlan MƏMMƏDZADƏ

**Ədəbi redaktor**
Eldəniz SALMANOV

**Nəşrə hazırlayan**
Salih Zeki MERIÇ

**Dizayner**
Nurgül MOLDALİEVA

**2008-06-Y-0003-684**
ISBN 975-19-4059-1

**Mətbəə**
Başak Matbaacılık
(0312) 384 27 61

**Ünvan**
Azərbaycan respublikası
Türkiyə Səfirliyi
Din Xidmətləri Müşavirliyi
Tel.: (012) 492 98 15

## ÖN SÖZ

Əziz balacalar!

Qoynunda yaşadığımız təbiətin bütün varlıqları ilə daima uca Allaha dua etdiyini bilirsinizmi? Ağaclar çiçək açarkən dua edər. Çaylar dənizə doğru axarkən dua edər. Quşların cəh-cəh vurması da bir duadır. Nə üçün insanlar bu möhtəşəm dua xoruna qatılmasın? Gəlin biz də təbiətin dua xoruna qoşulaq. Biz də çayların, dənizlərin, ağacların, çiçəklərin duasına qoşulaq. Bizə saysız nemətlər verdiyi üçün Allaha şükür edək. Bizə gözəlliklər bəxş etdiyi üçün ona həmd edək. Ata-analarımıza dua edək. Bacı-qardaşlarımıza, dostlarımıza dua edək. Böyüklərin apardığı mənasız müharibələrdən əziyyət çəkən azyaşlı uşaqlara dua edək. vətənimiz və millətimiz üçün dua edək. gecə yatarkən kiçik əllərimizi açıb dua edək. Səhər yerimizdən qalxarkən dua edək. yeməklərdən sonra dua edək. Rəbbimizin verdiyi nemətlərə görə ona həmd və şükür edək.

Əziz balacalar!

Diyanət İşləri Başqanlığı olaraq sizin üçün daha əvvəl “Dinimi Öyrənirəm”, “Kitabımı Öyrənirəm” və “Peyğəmbərimi Öyrənirəm” adlı üç kitab nəşr etmişdik. Bu kitabları çox sevib bəyəndiyinizi, sevə-sevə oxuduğunuzu görməkdən məmnun olduq. O kitablar başqa dillərə də tərcümə olunaraq nəşr edildi. İndi isə əlinizdə tutduğunuz bu kitabı sizə təqdim etməyin sevincini yaşayırıq. Bu kitabı da digərləri kimi sevib, yanınızdan ayırmayacağınızı düşünürük. Bu kitabla etdiyiniz duaları daha çox sevəcəksiniz. Eyni zamanda nə vaxt, harada və necə dua edəcəyinizi öyrənəcəksiniz. Başda sevimli Peyğəmbərimiz olmaqla digər peyğəmbərlərin dualarını öyrənəcəksiniz. Bu kitabla bağlı məktublarınızı, e-maillərinizi gözləyirik. Siz bizim gələcəyimizsiniz və biz sizi çox sevirik.

**DİYANƏT İŞLƏRİ BAŞQANLIĞI**

# İçindəkilər

ÜÇÜNCÜ FƏSİL

## SƏN DƏ DUA ET!

BİRİNCİ FƏSİL

# DUALARIM DİLƏYİMDİR



*Allah nəzdində duadan qiymətli heç nə yoxdur.*
(İbn Macə, Dua, 1)





## *Hər şey ona dua edir*

Yer üzündəki bütün canlılar havaya, suya, torpağa və günəşə möhtacdır. Dünyaya yeni göz açan körpə ana südünə və onun şəfqətli qucağına möhtacdır..

Bir toxum cücərmək üçün torpağa möhtacdır. Torpaq yağışa, yağış isə buluda möhtacdır. Quşlar uça bilmək üçün qanada, balıqlar yaşaya bilmək üçün suya möhtacdır. Yaşayan hər canlı öz varlığını davam etdirmək üçün başqa varlıqların yardımına möhtacdır. Heç bir şeyə möhtac olmayan yeganə varlıq Uca Allahdır. Çünki Allah kainatda mövcud olan bütün varlıqların tək yaradıcısıdır. Canlılara həyat verən odur. O, həyat verməzsə heç bir canlı yaşaya bilməz. Onun izni olmadan heç nə olmaz. Hər bir varlıq ona möhtacdır. Lakin o, heç nəyə möhtac deyil.

*Əgər (Mənə) şükür etsəniz, sizə (olan nemətimi) artıracağam.*
(İbrahim surəsi, 7-ci ayə)

Planetlər onun əmri ilə hərəkət edər. Ulduzlar onun əmri ilə işıq saçar. Günəş onun əmri ilə doğar və batar. Ay onun əmri ilə başımızın üstündəki səmanı nurlandırar.

O, yerin və göylərin, canlı-cansız bütün varlıqların Rəbbidir.

Aldığımız hər nəfəs, atdığımız hər addım, öyrəndiyimiz hər bir yenilik, əldə etdiyimiz bütün nailiyyətlər ancaq onun əmri ilə olur.



Ucsuz-bucaqsız bu dünyanı bizim üçün gözəlləşdirən odur. Tənəffüs etdiyimiz havanı, içdiyimiz suyu o yaratdı. Gecələr zülmətdə qalmayaq deyə ayı və ulduzları o yaratdı. Yağışın yağması üçün buludları, su ehtiyacımızı qarşılamaq üçün çayları o yaratdı. Hər birinin ayrı rəngi, ayrı dadı, ayrı ətri olan meyvə-tərəvəzi, çörək bişirmək üçün buğdanı, ətini yeyib, südünü içdiyimiz heyvanları o yaratdı. Hər şey o "ol" dediyi üçün var oldu.

Hər şey onun istəməsi ilə var olur. O, izin verməzsə əlimizə aldığımız suyu içə bilərikmi? Evdən çıxıb məktəbə gedə bilərikmi? Aldığımız nəfəsi təkrar geri verə bilərikmi? Əlbəttə ki, bütün bunları uca Allahın izni olmadan edə bilmərik.

Əgər danışa biliriksə, eşidiriksə, əl-ayağımızı hərəkət etdirə biliriksə bunların onun izni ilə olduğunu unutmayaq.

Hər bir canlı öz dilində danışır. Göylərdə və yerdə nə varsa hər biri öz dilində Allahı mədh edir. Hər bir varlıq öz dilində ona şükür edir, ondan nə isə istəyir.

Quşlar hər səhər cəh-cəh vurur, arılar çiçəkdən çiçəyə qonur, kiçik qarışqalar yuvalarına qida daşıyır, içində saxladığı ağacı meydana çıxarmaq istəyən toxum torpağa düşərək

su gözləyir, günəş istəyir, öz dilində Allaha dua edir: “Məni böyüt, mənə qol-budaq ver ki, insanlar faydalansın!” Hər bir varlıq Allahın ona verdiyi nemətə görə sevinir. Onlara bu sevinci verənə dua və şükür edir. Bütün mədhlər, təşəkkürlər yalnız onadır.

## *Allah dua etməyimizi istəyir*

Günəş hər səhər bizim üçün doğur. Cəh-cəh vuran quşlar, bal toplayan arılar, uçuşan kəpənəklər, əlvan çiçəklər, şırıl-şırıl axan çaylar, bulaqlar... bütün bunların hər biri bizim üçündür.

Uca Allaha verdiyi nemətlərə görə sonsuz sevgi və ehtiramımız var. Rəbbimiz bizi çox sevir. Bizi sevdiyi üçün bu qədər dəyər verir. Bizə qoxlamaq üçün burun, tutmaq üçün əl, dadmaq üçün dil, görmək üçün göz, duymaq üçün qulaq, yerimək üçün ayaq verən, bizi bir atadan və anadan yaradan uca Allaha nə qədər dua və təşəkkür etsək azdır.

Bir dostumuz bizə hədiyyə versə ona təşəkkür etməyi özümüzə borc bilərik. Çünki onun bizə dəyər verdiyini anlayarıq. Ata-anamıza olan sevgimizi müxtəlif yollarla göstərərik. Çünki onların üstümüzdə olan əməklərini əsla unutmarıq. Elə isə bizə bu qədər gözəlliklər verən, müxtəlif nemətlər bəxş edən Allahı unuda bilərikmi? Ona qarşı vəzifələrimiz yoxdurmu? Əlbəttə var. Ona qarşı olan vəzifələrimizin ilki onu sevmək, buyurduqlarına boyun əymək, verdiyi saysız-hesabsız nemətlərə görə ona təşəkkür etməkdir. Allah da bizim ona təşəkkür etməyimizi istəyir.

Uca Allaha təşəkkürümüzü yalnız ona ibadət və dua edərək yerinə yetirə bilərik. Rəbbimiz verdiyi nemətlərə dua



*Allah sizin danışığınızı eşidir. Həqiqətən, Allah (hər şeyi) eşidəndir, (hər şeyi) görəndir!*

(əl-Mücadələ surəsi, 1-ci ayə)





*Göylərin və yerin qeybini bilmək ancaq Ona məxsusdur. O, hər şeyi necə gözəl görür, necə də yaxşı eşidir!*

(əl-Kəhf surəsi, 26-cı ayə)





və ibadətlə təşəkkür edənləri sevir. Ona şükür edənlərə nemətini artırır.

## Allah dualarımızı eşidir

Varlığına inandığımız, güvəndiyimiz sonsuz mərhəmət və şəfqət sahibi Allah təala bizi çox sevdiyi kimi biz də onu sevirik. Arzularımızı və istəklərimizi ona ərz edirik. O, bizim ən kiçik dərdlərimizi, ən gizli sirlərimizi bilir. Dostlarımıza edəcəyimiz sürprizləri bilir. Ən dərin xəyallarımızı bilir və diləklərimizi həyata keçirir. Hər halımızdan xəbərdardır, səsimizi eşidir.

Səsimizin heç kəs tərəfindən eşidilməyəcəyi yerdə o, bizim səsimizi eşidir. Heç kimin bizi görə bilmədiyi yerdə o, bizi görür. Heç kimin kömək edə bilməyəcəyi yerdə o, bizə kömək edər.

Allah hər şeyi eşitdiyi kimi bizim dualarımızı da eşidir. Bizə verdiyi nemətlər üçün onu nə cür sayğı və minnətlə andığımızı bilir. İstər ürəyimizdə, istər xəfif səslə, istərsə də yüksəkdən dua etdiyimiz zaman o, bizi eşidir.

## Dualarım qəbul olmazsa?

Dua etmək bizdən, qəbul olması Allahdandır. Dualarımızı eşidən Rəbbimiz mütləq şəkildə onlara cavab verəcəkdir. Ancaq bu, heç də hər zaman duada istənilən şeyin həyata keçməsi demək deyil. Bizim borcumuz səbirlə duaya davam etməkdir. Buna görə də “Bir dəfə istədim, olmadı” deməməliyik. Unutmayaq ki, Rəbbimiz bizi haqqımızdakı ən xeyirli nəticəyə, ən uyğun bir zamanda çatdıracaqdır. Çünki

*Allah dualarınızı qəbul edir. Ancaq qəbul edilməsi üçün tələsməyin, "dua etdim, amma qəbul edilmədi" deməyin!*

(Tirmizi, Dəavat 12)





bizim üçün xeyirli olanı, bizə lazım olanı O, bizdən daha yaxşı bilir. İstəsə dilədiyimizi olduğu kimi verər, istəsə dilədiyimizdən artığını və ya fərqlisini verər. Bəzən də istədiyimizi bu dünyada verməz, əbədi həyat olan axirətdə verər.

## Rəbbimiz dualarımıza cavab verir

O, hər şeyin Rəbbidir. Mərhəmət sahibidir. Onun rəhməti hər şeyi əhatə etmişdir. Əl açıb ona yönələni, yalvarıb istəyəni, ona dua edəni çox sevir.

Bir qarışqanın ruzi axtarışına, bir körpənin ağlayışına cavab verən, acdığımızda bizi doyuran, buludlarla, çaylarla bizə su göndərən, xəstələndiyimiz zaman bizə şəfa verən, bizi pisliklərdən qoruyan odur.

O, bizim qəm-kədərimizi dağıdır, könlümüzü sükunətlə doldurur. Bir günah işlədiyimiz zaman Rəbbimizə yönələr, Ondan əfv diləyərik. Çünki O, rəhməti sonsuz, bağışlaması bol olandır.

Diləyimiz istər böyük, istərsə kiçik olsun onu həyata keçirmək Allaha çətin deyildir. O, bütün diləklərimizi istər bu dünyada, istərsə də axirətdə bizim yaxşılığımızı nəzərə alaraq yerinə yetirir. O, bizim dualarımıza cavab verərək rəhmətinin genişliyini göstərir. Rəbbimiz daima bizimlədir. Onunla sevinclərimizi və kədərlərimizi paylaşmaq necə də gözəldir.

## Sevincli anlarımızda dua

Bir şeyə sevindiyimiz zaman sevincimizi digər insanlarla paylaşmaq istəyirik. Sinifdən sinfə keçdikdə, dərslərimizdən

yaxşı qiymət aldıqda sevinirik. Ad günümüzdə, bayramlarda, toyda, uzaqdan gələn qohumumuza qovuşduqda sevinir və bu sevincimizi digər insanlarla paylaşmaq istəyirik. Belə zamanlarda bu sevincli anları bizə yaşadan Allahı da unutmadığımızı göstərməli və ona dua etməliyik. Sevincli anlarımızda dua etmək, Allaha olan hörmət və minnət duyğularımızı ifadə etmək deməkdir. Belə edəriksə Allah bizdən razı olar.

Məsələn,özümüz və ya yaxın bir adamımız xəstəlikdən və ya qəzadan xilas olduqda buna sevinirik. Bizi qoruduğu, bizə sağlıq və rahatlıq verdiyi üçün Allaha sevinclə dua edirik. Sinfi keçdikdə bizi müvəffəq edib sevindirən, bizə bu xoşbəxtliyi yaşadan Allaha təşəkkür edirik. Sevinc duyduğumuz hər bir hadisə qarşısında Allaha şükür ifadə edən hər söz duadır. Elə isə yalnız xəstələndikdə və ya yaxınlarımızı itirdiyimiz anlarda, kədərli zamanlarda deyil, xoşbəxt və sevincli anlarda da dua etməliyik.

Biz çətinliklərə, qüssələrə səbir edərək dua ilə qəddimizi düz tutmağı bacardığımız kimi əlimizdə olan nemətlərin, gözəlliklərin də əlimizdə qalması üçün dua etməliyik.



*Həqiqətən, Allah və Onun mələkləri Peyğəmbərə salavat göndərirlər (xeyir-dua verirlər). Ey iman gətirənlər! Siz də ona salavat göndərib dua edin!*

(əl-Əhzab surəsi, 56-cı ayə)





## *Kədərli anlarımızda dua*

İnsanın hər anı bir olmaz. Bəzən sevincli, bəzən də kədərli olur. Bəzən müşküllərin həllinin olmadığını, əlindən heç nə gəlmədiyini düşünərək ümidsizliyə qapılır. Məsələn, xəstələndikdə və ya yaxın adamı vəfat etdikdə insan özünü çarəsiz və yalnız hiss edir. Məhz belə hallarda dua etmək insana güc-qüvvət və təsəlli verir. Bu kimi hallarda dua vasitəsilə insan səbirli və ümidli olur. Çünki dua edən adam Allahın hər şeyə

gücünün çatdığını və ona yardım edəcəyini bilir. Beləliklə qüssə və kədərlərini yox etməsi üçün Allaha sığınır. Dərdlərini onunla paylaşaraq rahatlar və sakitlik tapar, özünə güvənər. Məsələn, bir dərsdən pis qiymət alsa ümidsizliyə düşməz, dərslərinə daha yaxşı çalışar, ev tapşırıqlarını vaxtında edər, sonra da "Allahım, dərslərimdə müvəffəq olmaq üçün mənə yardımçı ol!" deyərək dua edər. Xəstələndikdə həkimə gedib müalicə olunar, sonra isə "Allahım, mənə sağlıq ver!" deyərək Allaha diləyini çatdırar. Yalnız özünün deyil, başqalarının da müşküllərinin həll olması üçün Allaha dua edər.



*Qəbul ediləcəyinə yəqinliklə inanaraq Allaha dua edin.*

(Tirmizi, Dəavat)





## *Dua sevgi və yaxınlıqdır*

Allah yaratdığı bütün varlıqları sevir. Onun yaratdıqları arasında insanın xüsusi yeri var. Çünki Allah digər varlıqlara vermədiyi ağıl və düşüncə kimi keyfiyyətləri insana vermişdir. Kainatda nə varsa hər birini insanın əmrinə vermişdir. Bütün bunlar Allahın insanı sevdiyini və ona dəyər verdiyini göstərir.

Bir insanın bizim yaxşılığımızı düşündüyünü bilsək onu sevərik. Özümüzü ona yaxın hiss edərik. Onun bizə olan sevgisi bizdə sevgi yaradır. Ona olan bu sevgimizi özünə söylər, hərəkətlərimizlə bunu büruzə verərik. Bu kimi davranışlarımızla sevgimizi nümayiş etdirmək aradakı sevginin artmasını və o adamla daha yaxın olmamızı təmin edər. Eyni şəkildə bizi sevən, ətrafımızdakı gözəllikləri yaradıb xidmətimizə verən Allaha bu şəkildə sevgi ilə bağlanırıq. Onun sevgisinə və yaxınlığına dua edərək qarşılıq veririk. Dualarımızda ona olan sevgimizi dilə gətiririk. Düşüncə və duyğularımızı hər şeyə gücü yetən Allaha çatdırır, diləklərimizi onunla paylaşır

və ondan yardım istərik. Beləcə, Allahla aramızda sevgi və yaxınlıq artar. Çünki Allahın hər zaman yanında olduğunu, yardımını əsirgəməyəcəyini bilən insan sevgi və ehtiramla ona yönələrək dua edər. Dua etdikcə daxili (mənəvi) rahatlıq və xoşbəxtlik hiss edər, qorxuları azalar.

Dua etmək yalnız insanla Allah arasında deyil, digər insanlarla da aramızda sevgi və yaxınlıq meydana gətirir. Çünki dua edən insan hamının yaxşılığını istəyər.



Gündəlik həyatımızda sevdiklərimiz üçün dua xarakterli sözlər söylər, onlar üçün xoş diləklər edərik. Bizə yaxşılıq edən adama təşəkkür etdiyimiz kimi. Yola çıxanlara "Güləgülə, yolunuz uğurlu olsun, yaxşı yol" deyirik. Yemək yedikdən sonra yemək hazırlayanlara "Əllərinizə sağlıq, süfrənizə bərəkət" deyərək dua edirik. Xəstələrə "Allah şəfa versin, yastığın yüngül olsun" deyirik. Vəfat edən tanışlarımızın yaxın adamlarına da "Allah rəhmət eləsin" deyirik. Bu sözlərin hamısı yaxşı arzu və dilək dualarıdır. Bunları söyləyərək dua etmək yalnız özümüz üçün deyil, digər insanların sağlıq və xoşbəxtliyi üçün də dua etmək insanlarla aramızda sevgi və yaxınlığın möhkəmlənəsinə xidmət edər. Çünki hər bir insanın başqaları tərəfdən xoş diləklər eşitməkdən xoşu gəlir.

## *Dua həyatımıza gözəlliklər verər*

Biz dua ilə dünyaya gəldik. Qulağımıza azan və iqamə oxundu. Yaxşı insan, vətənə, millətə xeyirli övlad olmamız üçün böyüklərimiz bizə dua etdi. Dua ilə ayaq açıb yeridik. Dua ilə məktəb yaşına çatdıq. Ata-anamız: "Övladım, Allah səni dərslərində müvəfəq etsin" deyərək bizi məktəbə göndərdi. Beləcə, dua ilə məktəb həyatımız başladı.

Atamız dua edərək işə gedir. Yediyimiz çörəyin toxumu dua ilə torpağa atılır. Bağçalar dua ilə sulanır. Anamız ən gözəl yeməkləri dua ilə bişirir. Süfrələrimiz dua ilə açılır, dua ilə yığılır. Evlənmək yaşına gələn bacılarımız dua ilə uğurlanır. Xəstə ziyarətlərində xəstələrə şəfa üçün Allaha dua edirik. Dua ilə səfərə çıxırıq. Bizdən böyük qardaşlarımız əsgər gedərkən dua ilə uğurlanır. Vəfat edənləri də dua ilə axirətə yola salırıq. Biz dua ilə dünyaya göz açır, dua ilə böyüyür və dua ilə yaradanımıza qovuşuruq. Qısaca olaraq deyə bilərik ki, bir müsəlmanın həyatı dua deməkdir.



## *Hər zaman və hər yerdə dua*

Əlbəttə ki, insanlar hər yerdə, hər şəraitdə, istədikləri hər şey üçün Rəbbimiz olan Allaha dua edə bilərlər. Çünki dua Allahı anmaq, harada olsaq onun bizə çox yaxın olduğunu unutmamaqdır.

Dua etmək üçün müəyyən bir yer yoxdur. Məktəbə gedərkən, evə qayıdarkən, gecə yatarkən, səhər yuxudan qalxarkən, oturarkən, dərs hazırlarkən, küçədə gəzərkən, bir sözlə, hər zaman və hər yerdə istədiyimiz kimi dua edə bilərik.

Sağlamlıq və xoşbəxtliyimiz üçün, dostlarımızın və müəllimimizin müvəffəq olması üçün də hər zaman dua edə bilərik. Allaha yalvarmaq üçün müəyyən bir zaman məhdudiyyəti yoxdur. 24 saatımızın hər dəqiqəsində dua edə bilərik. Lakin bunu da bilməliyik ki, ən məqbul dua heç kimin olmadığı zaman etdiyimiz duadır. Dua etmək üçün ən münasib zamanlardan biri də gecədir.

Sevimli Peyğəmbərimizdən öyrəndiyimizə görə uca Allah gecə dua edənlərin duasını qəbul edir. Ondan bir şey istə-

yənin istəyini qəbul edir. Əfv diləyənləri bağışlayır. Elə isə biz də Peyğəmbərimizin bu öyüdünə tabe olaraq gecələr çox dua etməyə çalışaq. Həmçinin cümə günü və mübarək gecələrdə dualarımızın qəbul olunması üçün bir fürsətdir. Bu gecələrdə böyüklərimiz ilə birlikdə dua edə bilərik. Hamı birlikdə məscidə gedib cəm halında edilən dualara qoşula bilərik. Uca Allah insanların cəm halında və könüldən etdikləri duaları çox sevir.



## *Necə dua edək?*

Dua yalnız Allaha edilir. İnsan dua edərkən diləklərini Allaha çatdırır. Duyğu və düşüncələrini daxilindən gələn sözlərlə ona açar.

Dua etmək çox asandır. İbadətlərdə olduğu kimi dua etməyə başlamaq üçün bir çox qayda-qanun yoxdur. Ancaq duadan əvvəl bəzi hazırlıqlar görülməlidir. Əvvəlcə düşüncələrimizi, duyğularımızı dua üçün hazırlamalıyıq. Ağlımız bir yerdə, dilimiz başqa yerdə olmamalı, nə dediyimizi bilməli, necə dua etdiyimizi anlamalıyıq.

Duamızın qəbul olması üçün dua etməzdən əvvəl bəzi xeyirxah işlər görə bilərik. Ata-anamıza, dostlarımıza, qonşularımıza yaxşılıq edə, heyvanlara və bitkilərə sevgi və qayğı göstərə bilərik.

Duadan əvvəl dəstəmaz almaq gözəl davranışdır.

Dualarımızda bir neçə nöqtəyə diqqət etməklə dualarımıza gözəlliklər qatmış olarıq. Dualarımıza başlamadan əvvəl iki kiçik cümləni söyləməliyik. Biri “həmd”, digəri isə “salavat”dır. Həmd uca Allahı mədh etmək, ucaltmaqdır. Dualarımızın başlanğıcında uca Allahı mədh etməliyik.

Öyülməyə və şükür edilməyə layiq olan Odur. Çünki kainatdakı bütün gözəlliklər Onun yaratması ilə var olur. Bütün nemətləri göndərən, hər kəsi yaradan və yaşadan, bəsləyən Odur. Hər bir həmd və təşəkkür Ona məxsusdur. Onu "Uca Allahım, sənə həmd edirəm!" şəklində öyə bildiyimiz kimi, hər namazda oxuduğumuz Fatihə surəsinin ilk ayəsini də söyləyə bilərik: "Əlhəmdülillahi rəbbil-aləmin." Bunu dedikdən sonra sevimli Peyğəmbərimiz üçün dua etməyi də unutmamalıyıq. Ona edilən duaya "salavat" deyilir. Salavat cümləsi belədir: "Allahummə salli alə Muhammədin və alə əli Muhamməd." Bu cümənin tərcüməsi: "Allahım, sevimli Peyğəmbərimiz Məhəmmədə və onun ailəsinə, yaxınlarına rəhmət et!" Bu cümlənin ərəbcəsini bilməyənlər tərcüməsini də oxuya bilərlər.



Dualarımıza uca Allahı mədh edərək və Peyğəmbərimizə salavat gətirərək başlamaq onların qəbulunu asanlaşdırır. Uca Allah bu cür dua etməmizdən razı qalır. Çünki Rəbbimiz Peyğəmbərimizi çox sevir. Biz də onu canımızdan çox sevməliyik. Bizə bir adam uzaqda olan və çox sevdiyimiz dostumuzdan salam gətirsə nə qədər seviniriksə, dua edərkən Peyğəmbərimizin adını çəkmək də elədir.

Bütün bunlardan sonra müqəddəs kitabımız Qurani-Kərimdə keçən və ya sevimli peyğəmbərimizin etdiyi nümunə dualardan da istifadə edə bilərik. Ürəyimizdən gəldiyi kimi də dua etmək mümkündür.

Dua etmək üçün əllərimizi yuxarı qaldırmaq vacib deyil. Ancaq dua edərkən əlləri yuxarı doğru açmaq istək və yalvarış işarəsidir. Duada mühüm olan göstərişdən uzaq və səmimi şəkildə yalnız Allahdan istəməkdir.

Dualarımızı qəlbimizdən gəldiyi kimi edək. Dua cümlələrimiz sadə və yalın olsun. Uca Allah qəlbən edilən səmimi duaları sevər, qəbul edər. Rəbbimiz sözlərə deyil, bəndənin qəlbindəki coşğuya, həyəcana, sözlərindəki səmimiyyətə baxar.

Dualarımızı yüksək səslə etməyə də gərək yoxdur. Uca Allah qəlbimizdən keçirdiyimiz hər şeyi bilir. Özümüz eşidəcək səslə dua etmək kifayətdir.



Dua edərkən Allahdan ən gözəl şeyləri istəyək. Bir böyüyümüzdən nə isə istərkən diqqətlə ədəb-ərkan qaydalarına riayət etdiyimizdən daha artığını Allahdan bir şey istərkən nümayiş etdirməliyik. Ondan istərkən sevgi və ehtiram cümlələri ilə istəməliyik. Eyni zamanda dünyada istədiyimiz şeylərlə yanaşı axirət səadətini də Rəbbimizdən istəməyi unutmayaq. Çünki axirət bizim əbədi yurdumuzdur. Oradakı xoşbəxtlik və səadət bizim üçün çox vacibdir. Burada da yaxşılıq və gözəllikləri yalnız özümüz üçün deyil, bütün insanlar üçün istəməliyik.

## *Peyğəmbərimizin həyatında dua*

Sevimli Peyğəmbərimizin həyatında duanın çox böyük yeri vardır. O, dua etməyi, uca Allaha sığınmağı çox sevərdi. Hər işə dua ilə başlardı. Müsəlmanlara da çoxlu dua etməyi, bir işə duasız başlamamağı tövsiyə edərdi.

O, yalnız özü üçün dua etməz, bütün bəşəriyyətin qurtuluşu üçün də dua edərdi. Müsəlmanların dünyada və axirətdə xeyir əldə etmələri üçün xüsusilə namazlardan sonra dua edər, ən qiymətli duaların "inananların bir-birilərinə etdiyi"

dualar olduğunu söylərdi. Biz də sevdiklərimizə dua etməyi yaddan çıxarmayaq.

Sevimli Peyğəmbərimiz gündəlik həyatının bu anlarında dua edərdi:

Peyğəmbərimiz evindən və məsciddən çıxarkən yaxşılıq və gözəlliklərə nail olmaq üçün dua edərdi. Yenə bu yerlərə girərkən eyni şəkildə dua edərdi.

Xanımlarına və uşaqlarına dua etməyi unutmazdı. Onları uca Allaha əmanət edərdi.

Yola çıxmazdan əvvəl səfərinin yaxşı və qəzasız keçməsi üçün dua edərdi. Səfərdən qayıdanda da ailəsini sağ-salamat görmək üçün Allaha sığınardı.



Yaxın bir adamı və ya dostu uzaq səfərə çıxarkən onun əlini sıxar, qucaqlaşar, səfərinin uğurlu olması üçün Allaha dua edər və xoş diləklər edərdi.

Bir işə başlarkən işin asan olması, o işdə çətinliklərin çıxmaması üçün dua edərdi.

Dostları ilə söhbətə başlarkən gözəl keçməsi üçün Allaha yalvarardı. Söhbət qurtardıqdan sonra da fərqində olmadan edilən xətalardan dolayı Allahdan əfv-məğfirət diləyərdi.

Bazara çıxdıqda işlərinin səmərəli olması üçün dükan sahiblərinə xeyir-dua edərdi.

O, uşaqları çox sevərdi. Ata-analar dünyaya yeni göz açan körpələrini sevimli Peyğəmbərimizin yanına aparıb, onun üçün Allaha xeyir-dua etməsini istəyərdilər. O da körpəni qucağına alar, öpərək əzizləyər, uzun ömürlü və yaxşı insan olması üçün Allaha dua edərdi.

O, xəstələnən və ya hansısa dərdi olan müsəlmanları yoluxar, sağalmaları üçün dua edərdi.

Yeməkdən əvvəl və sonra dua etməyi yaddan çıxarmazdı. Xüsusilə yeməyin bərəkətli olması üçün dua edər, aclıqdan Allaha sığınardı.

Yatağa girdikdə də dua edərdi. İxlas, Fələq və Nəs surələrini oxuyar, uca Allaha sığınaraq yaxşılıqlarla oyanmaq üçün dua edərdi. Sabaha dinc və sağlam çıxdığı üçün də Allaha şükür edərdi.



Quraqlıq zamanı isə ölkə torpaqlarının bərəkətli olması, heyvanların susuz qalmaması üçün dua edərdi. Zəlzələ və sel basqınlarından, hər cür pislikdən və düşmən hücumundan uca Allaha sığınardı.

Bizə dua etməyi Peyğəmbərimiz öyrətdi. Biz də onun öyrətdiyi şəkildə dua edirik.

## *Bəddua etməyin!*

Dinimiz İslam kiminsə haqqında pis diləklər etməyi əsla yaxşı qarşılamır. Allah təala “Allah bəlanı versin, Allah zəlil etsin, Allah səni kor etsin!” kimi bədduaları sevməz. Bu səbəblə sevdiklərimiz üçün istədiyimiz qədər sevmədiklərimizin də yaxşılığını istəmək lazımdır. Unutmayaq ki, sevimli Peyğəmbərimiz rəhmət peyğəmbəridir.

Dua mövzusunda sevimli peyğəmbərimizi nümunə götürək. O, Məkkədə yaşadığı illərdə İslamı yaymaq üçün Taifə getdiyi zaman orada pis şəkildə qarşılanmış, daş-qalaq edilmiş, mübarək ayaqları qanlar içində qalmışdı. O əsnada Allah tərəfindən ona taiflilər üçün edəcəyi bədduasının qəbul

ediləcəyi, istərsə onların yer üzündən silinəcəyi bildirilmişdi. Lakin Peyğəmbərimiz “Xeyr, bəlkə bunların soyundan Sənə ibadət edəcək uşaqlar dünyaya gələr, Allahım!” - demişdi. Uhud döyüşündə dişini qıran, üzünü yaralayan düşmənləri üçün “Allahım, qövmümə hidayət ver! Onlar nə etdiklərini bilmirlər.” deyə dua etmişdi.

Sevimli Peyğəmbərimizi nümunə götürərək hərəkət etdiyimiz zaman daima insanların yaxşılığını istəyərik. Başqa biri bizə pislik də etsə onun yaxşı insan olması və pis işlərdən əl çəkməsi üçün Allaha dua edərik. Ən çətin anda belə, ağzımızdan pis söz çıxmaz. Pis adamları Allaha tapşırarıq. Pis insanların öhdəsindən yalnız o gələr. Çünki o, yaxşı insanları mükafatlandırır. Tövbə etməyən, günahlarından peşman olmayan və pis işlərə davam edənləri cəzalandırır.



Elə isə pis adamların yaxşı insan olmaları və pis işlərdən əl çəkmələri üçün Allaha dua edək. Əllərimizi uca Allaha açaraq dünyada pislərin və pisliklərin çoxalmaması üçün yalvaraq. Uca Allahdan sevgi və sülh dolu bir dünya istəyək.

*Oxu...*

**BÖYLE OL, BÖYLE SÖYLE**

(...)
Önce besmele
En güzel kelime

Allahım
Yol boyunca
Bırakma elimi
Düşerim sonra

Allahım
Niçin halk ettinse beni
Kalbime söyle iyice
Engellerden arınsın yolum



Allahım
Nasıl pırıl-pırılsa
Güzelse sevdiğin kulların
Öyle güzel kıl beni

Allahım
O güzeller güzeli
Hangi iyilik diledi senden
Dilerim ben öylelerini

Allahım
Peyğamber efendimiz
Hangi şerlerden sığındıysa sana
Upuzak tut benden de onları

Allahım
Yol boyunca
Tarih boyunca
Başıboş bırakma bizi

*Cahit Zarifoğlu*

Halk etmek – yaratmaq



## SEN DUYARSIN

Fısıltılı sesleri
Kalpteki hevesleri
En zayıf nefesleri
Sen duyarsın Allahım

Gögün gürültüsünü
Suyun şırıltısını
Dua mırıltısını
Sen duyarsın Allahım

Arılar ne söylese
Kuşlar niyaz eylese
Bir çocuk “Allah” dese
Sen duyarsın Allahım

**M. Yaşar Kandemir**

İKİNCİ FƏSİL

# QURANİ-KƏRİMDƏN VƏ PEYĞƏMBƏRİMİZİN DİLİNDƏN DUALAR



*Mənə dua edin, Mən də sizin dualarınızı qəbul edim!*

(əl-Mumin surəsi, 60-cı ayə)





## *Qurani-Kərimdən dua nümunələri*

Uca Rəbbimiz Qurani-Kərimdə bizə necə dua ediləcəyini göstərir. Peyğəmbərlərin, yaxşı bəndələrin, haqsızlığa uğrayan çarəsiz insanların etdikləri dualardan misallar verir.

Qurani-Kərimin ilk surəsi olan Fatihə başlı-başına çox gözəl duadır. Digər surələrdə də dualar var. Rəbbimiz yalnız özümüz üçün deyil, başqaları üçün də dua etməyimizi istəyir.

## *Bir işə və ya sözə başlama duası: Bismillah*

Biz Allahın varlığına və birliyinə inanırıq. Bizə sonsuz nemətlər verdiyi üçün də onu çox sevirik. Ona olan sevgimizi və bağlılığımızı göstərə bilmək üçün hər işə onun adıyla, yəni bismillahla başlayırırq.



*Dua ibadətin əsasıdır.*
(Tirmizi, Dua, 1)





“Bismilləhir-rahmənir-rahim” “Rəhman və rəhim olan Allahın adıyla” deməkdir. “Bismillah” bu cümlənin qısa deyilişidir. Yəni “Allahın adıyla” başlayıram deməkdir.

Sevimli Peyğəmbərimiz bismillahsız başlanan bir işin nəticəsiz, yeyilən yeməyin də bərəkətsiz olacağını söyləmişdir. Bu səbəblə gündəlik həyatımızdakı işlərə başlarkən bismillah deyirik. Məsələn, yola çıxarkən, dərs çalışarkən, yeməyə başlarkən, yatanda və duranda bismillah deyirik. Bununla da Allaha belə dua etmiş oluruq:

“Allahım, canlı-cansız hər şeyi yaradan, bəsləyən, böyüdən, mühafizə edən sənsən. Məni yaradan və yaşadan da sənsən. Mənə ağıl və qüvvət verən də sənsən. Ancaq mənim hər şeyə gücüm çatmaz. Sənin adını anmaq mənə güc və asanlıq verir. Buna görə də işlərimə sənin adınla başlayıram. Mənə yardım et. Sənin hər şeyə gücün çatar.”

Hər işin başında bismillah demək hər qapını açan açar kimi o işə təsir edər, asanlıq və bərəkət gətirər. Bir işə Allahın adıyla başladıqda Allah bizə yardım edər və işimizi asanlaşdırar. Bismillah çəkərək Allahı anmış, ona inandığımızı, onun bəndəsi olduğumuzu və ondan kömək istədiyimizi göstərmiş oluruq. Çünki bilirik ki. Allahın yardımı olmadan heç bir işi müvəffəqiyyətlə sona çatdıra bilmərik. Bismillah deyərək Allaha olan imanımızı, ona olan sevgimizi təzələr və Allahın hər an bizimlə olduğunu dərk edərik.

Hər səhər bizim üçün yeni bir gün başlayır. Bu yeni gündə səhər yatağımızdan qalxarkən, bizi yeni günə oyandıran Rəbbimizin adını andıqda, gölə atılan kiçik bir daşın bütün suyu dalğalandırması kimi, bütün günümüzə bir gözəllik və

sükunət yayılır. Bismillah demək eyni zamanda "Allahım, sənin verdiyin güclə, sənin yaratdığın yeni günə başlayıram. Bu yeni günə başlarkən səni anır, sənə yönəlir və səndən yardım istəyirəm. Məni pisliklərdən qoru və yaxşılıqlara qovuşdur. Günümü gözəlliklərlə doldur!" deməkdir.

Sevimli Peyğəmbərimiz belə buyurur: "Kim evindən çıxarkən bismillah deyib Allahın adını anar və Allaha güvəndim, pisliklərdən qoruyacaq və yaxşılıqlara qovuşduracaq güc və qüvvət Allahdandır, deyərsə ona belə cavab verilir: Doğru yola salındın, ehtiyacların həll olundu və pisliklərdən qorundun." (Əbu Davud, Ədəb 103)

Süfrəyə oturduqda da bismillah deməyi unutmamalıyıq. Çünki oturduğumuz süfrədə Allahın bizə verdiyi müxtəlif nemətlərlə qarşılaşırıq. Yeməyə başlarkən bismillah dedikdə də süfrəmizə gələn hər bir qida üçün, hər bir loxma üçün təşəkkür etmiş oluruq. Nemətləri verənin Allah olduğunu xatırlar, ona şükrümüzü və sevgimizi bildiririk. Şükür etdiyimiz üçün qəlbimiz fərəhlə dolar. Çünki Allah Qurani-Kərimdə "Məni xatırlayın ki, Mən də sizi yada salım! Mənə şükür edin, Məni danmayın!" -buyurur. (əl-Bəqərə surəsi, 152-ci ayə)

Hər gün Allahın adıyla başlar. Gün ərzində baş verənlər Allahın adıyla olur və o gün Allahın adıyla sona çatar. Gündüz gedər, gecə gələr. Rəbbimiz bütün varlıqları bir örtü və yorğan kimi bürüyən gecəni bizim dincəlməmiz və ertəsi günə rahat başlamamız üçün yaratmışdır. Allahın digər nemətlərindən istifadə edərkən bismillah deyərək onun adını anıb, ona təşəkkür etdiyimiz kimi, bizə bəxş etdiyi yuxu nemətindən istifadə etməyə başlarkən də bismillah deməli-



*(Ya Rəsulum!) Bəndələrim Məni səndən soruşduqda söylə ki, Mən (onlara) yaxınam. Dua edib Məni çağıranın duasını qəbul edərəm. Gərək onlar da Mənim çağırışımı qəbul edib Mənə iman gətirsinlər.*

(əl-Bəqərə surəsi, 186-cı ayə)



yik. Beləliklə səhər tezdən bismillahla qalxdığımız yatağımıza yenə bismillahla girmiş olarıq. Sevimli Peyğəmbərimiz kimi biz də "Allahım, sənin adınla yatır, sənin adınla oyanıram" deyərək yuxuya dalarıq.



*Rəbbinizə yalvara-yalvara, həm də gizlicə dua edin.*

(əl-Əraf surəsi, 55-ci ayə)





## *Sonsuza açılan qapı: Fatihə surəsi*

Fatihə açmaq və başlanğıc deməkdir. Qurani-Kərimi açdığımız zaman ilk qarşılaşdığımız surə Fatihədir. O, Qurani-Kərimin xülasəsi, ən böyük dua və Allaha yalvarışdır. Hər zaman Fatihə surəsini oxuyaraq Allaha dua edə bilərik. Qurani-Kərim oxunduqdan sonra, dua etdikdən sonra, ölülərimizin arxasınca və qıldığımız namazların hər rükətində Fatihə surəsini oxuyuruq. Surənin sonunda da "Allahım, qəbul et!" mənasına gələn "Amin" deyirik.

## *Fatihə surəsi*

"Mərhəmətli, rəhmli Allahın adı ilə! Həmd (şükür və tərif) olsun Allaha (və ya: Həmd məxsusdur Allaha) - aləmlərin Rəbbinə, (Bu dünyada hamıya) mərhəmətli, (axirətdə isə ancaq möminlərə) rəhmli olana, Haqq-Hesab (qiyamət) gününün sahibinə! Biz yalnız Sənə ibadət edirik və yalnız Səndən kömək diləyirik! Bizi doğru (düz) yola yönəlt! Nemət verdiyin kəslərin yoluna! Qəzəbə düçar olmuşların və (haqdan) azmışların (yoluna) yox!"

Kainatı və bütün varlıqları, planetləri, ulduzları, ayı və günəşi yaradan Allahdır. O, bildiyimiz və bilmədiyimiz, gördüyümüz və görmədiyimiz hər bir varlığın yaradıcısıdır. Yaratdıqlarını ən gözəl şəkildə yaratmışdır.

*Bismillahla başlamayan hər iş bərəkətsizdir.*

(Beyhəqi, Sünən, III, 209)





Allah yaratdığı hər şeyə bir vəzifə vermiş, onların da vəzifələrini ən gözəl şəkildə yerinə yetirmələrini istəmiş və onları Rəbb ismiylə tərbiyə etmişdir. Məsələn, bir körpə doğulduğu ilk gün necədirsə elə də qalsaydı danışa bilməz, yeriməz, və böyüməzdi. Bütün bunları ona öyrədən Allahdır. Quşlara uçmağı, ipəkqurduna ipək hörməyi, arıya bal hazırlamağı, dünyaya günəşin ətrafında fırlanmağı öyrədən Allahdır.

Hər şey öz dili ilə aləmlərin Rəbbi olan Allaha təşəkkür edir və onun şanına təriflər deyir. Elə isə yaradılmışların ən gözəli olan insan da ən gözəl şəkildə Rəbbini anmalıdır.

Allah rəhmandır. Onun rəhməti hər şeyi əhatə etmişdir. Bütün varlıqlar haqqında xeyir, rəhmət və gözəllik diləmiş, sevdiyi ilə sevmədiyi arasında ayrı-seçkilik etmədən onlara saysız-hesabsız nemətlər bəxş etmişdir.

Allah rəhimdir. Rəhməti axirət günü yalnız möminləri əhatə edən, verdiyi nemətlərdən yaxşı istifadə edənləri daha böyük nemətlərlə mükafatlandırandır.

Həyatı da, ölümü də yaradan Allahdır. Canlı olan hər şey dünyaya gəlməkdə, böyüməkdə və ölməkdədir. Bahardan qışa doğru dəyişən mövsümlər sanki bizə həyatın gedişatını göstərir. Bahar mövsümündə yamyaşıl olan təbiət qış aylarında kəfənə bənzəyən ağappaq örtüyün altında uyuyur.

Hər canlı kimi insan da bir gün öləcəkdir. Lakin ölüm son deyildir, yeni və fərqli bir həyatın başlanğıcıdır.

Gözlərimizi bu dünyaya bağlayan ölüm eyni zamanda başqa bir həyata, axirət həyatına onları yenidən açar. Əvvəlcə orada hər şeyin hesabı soruşulur. Dünyada ikən işlədiyimiz savab və günah əməllər qiymət cədvəli kimi qarşımıza çıxar.

Dünya həyatı axirət üçün hazırlıqdır. Bu dünyada etdiyimiz işlər axirətdə ya yolumuzu aydınladacaq, ya da qaraldacaqdır. Hər kəsin hesaba çəkiləcəyi o gün aləmlərin Rəbbi olan Allaha qovuşma günüdür.

Rəbbimiz yaradılışımızın məqsədini belə bildirir:

"Mən cinləri və insanları yalnız Mənə ibadət etmək üçün yaratdım!" (əz-Zariyat surəsi, 56-cı ayə) Biz də yaradılışımızın məqsədini bilərək onu yerinə yetirir, ibadət edir və əllərimizi açaraq ona yalvarırıq.

Allah bənədlərinin darda qalmasını, sıxıntıya düşməsini istəməz. Dünya bir imtahan yeri olduğu üçün bəzən çətinliklərlə qarşılaşacağıq. Belə hallarda Rəbbimizə əl açmalıyıq ki, bizə yardım etsin. Çünki Allah Ona inanan, Ona sığınan insanların daim yardımçısıdır.

Allah insanları doğru yola çəkmək üçün peyğəmbərlər və kitablar göndərdi. Bizim vəzifəmiz son peyğəmbər Həzrət Məhəmməd (s.ə.s)-i nümunə götürmək və ona göndərilən Qurani-Kərimi oxumaqdır. Ancaq belə edəriksə ayədə buyurulan doğru yolu tapmış olarıq.

Allah tərəfindən nemət verilən kəslər bu nemətlər qarşısında ona şükür edib, nemətin gərəyini yerinə yetirirlər. Onlar peyğəmbərlər, şəhidlər, davranışları ilə, ortaya qoyduqları əsərlərlə insanlara nümunə olan gözəl insanlardır.

Qəzəbə düçar olanlar isə onun əmr və qadağalarına məhəl qoymayan, verdiyi nemətləri düşünməyən, bu nemətlər üçün şükür etməyənlərdir. Hətta onlar peşmanlıq çəkib Allahdan əfv diləməzlər. Onlar bu nankorluqları səbəbi ilə Allahın qəzəbinə uğramış, doğru yoldan çıxmışlar. Biz də onlar kimi



*Ən gözəl adlar (əsmayi-hüsna) Allahındır. Onu bu adlarla çağırıb dua edin.*

(əl-Əraf surəsi, 180-ci ayə)







*Ey Allahım, səni sevməyi, sevdiklərini sevməyi və sevginə aparacaq əməlləri nəsib etməni səndən diləyirəm. Ey Allahım, sevgini mənə nəfsimdən, ailəmdən və soyuq sudan daha sevimli et.*

(Tirmizi, Dua 73)



olmamaq üçün davranışlarımıza diqqət edər, Rəbbimizə bizi "Qəzəbə düçar olmuşların və (haqdan) azmışların (yoluna) yönəltmə!" -deyə dua edərik.

## Əsmayi-hüsna ilə dua

Dua istək və ehtiyaclarımızı Allaha duyurmaqla yanaşı, eyni zamanda Allahı anmağın, onu ucaltmağın yoludur. "Ən gözəl adlar (əsmayi-hüsna) Allahındır. Onu bu adlarla çağırıb dua edin." (əl-Əraf surəsi, 180-ci ayə) Qurani-Kərimdə, xüsusilə peyğəmbər dualarında Rəbbimiz isimləri ilə ucaldılmaqda və tərif edilməkdədir.

Sevimli Peyğəmbərimiz bir hədisində uca Allahın 99 adının olduğunu, bu adlara inanan və bu yolda hərəkət edən kimsənin cənnətə girəcəyindən xəbər verir. Əlbəttə ki, Allahın adları 99-dan ibarət deyildir. Hədisdə 99 sayının vurğulanması məhdudlaşdırmaq mənasında deyil, bu adların Allahın ən çox bilinən adları olması səbəbilədir.

Dua edərkən Allahın bu adlarından da istifadə edə bilərik. Rəhman adıyla bizə mərhəmət etməsini, Rəzzaq ismiylə ruzimizi bərəkətləndirməsini, Vədud ismiylə bizi sevməsini və sevdirməsini istəyə bilərik.

## Ən böyük dua: Ayətəl-Kürsi

Sevimli Peyğəmbərimiz "Hər şeyin bir zirvəsi vardır. Quranın zirvəsi Bəqərə surəsidir. Onda Quran ayələrinin şahı olan bir ayə vardır. O, Ayətəl-Kürsidir." (Tirmizi, Savabul-Quran 2) buyurmuşdur.



*Ey Rəbbimiz! Bizi doğru yola yönəltdikdən sonra ürəklərimizə şəkk-şübhə (azğınlıq, əyrilik) salma! Bizə Öz tərəfindən bir mərhəmət bəxş et, çünki Sən, həqiqətən, (bəndələrinə mərhəmət, nemət) bəxş edənsən!*

(Ali-İmran surəsi, 8-ci ayə)





Ayətəl-Kürsinin mənası belədir:

"Allahdan başqa heç bir tanrı yoxdur. (Zatı və kamal sifətləri ilə hər şeyə qadir olub bütün kainatı yaradan və idarə edən, bəndələrini dolandıran və onların işlərini yoluna qoyan) əbədi, əzəli varlıq Odur. O nə mürgü, nə də yuxu bilər. Göylərdə və yerdə nə varsa (hamısı) Onundur. Allahın izni olmadan (qiyamətdə) Onun yanında (hüzurunda) kim şəfaət (bu və ya digər şəxsin günahlarının bağışlanmasını xahiş) edə bilər? O, bütün yaranmışların keçmişini və gələcəyini (bütün olmuş və olacaq şeyləri) bilir. Onlar (yaranmışlar) Allahın elmindən Onun Özünün istədiyindən başqa heç bir şey qavraya bilməzlər. Onun kürsünü (elmi, qüdrət və səltənəti) göyləri və yeri əhatə etmişdir. Bunları mühafizə etmək Onun üçün heç də çətin deyildir. Ən uca, ən böyük varlıq da Odur!" (əl-Bəqərə surəsi, 255-ci ayə)

Ayətəl-Kürsidə Allahın ucalığı, sifətləri, kainatda baş verən hadisələrin tamamən onun əmriylə gerçəkləşdiyi, onun istəyi və izni olmadan heç kəsin başqa birinə şəfaət edə bilməyəcəyi, göylərdə və yerdə olanların ona aid olduğu haqqında xəbər verilməkdədir.

Ayətəl-Kürsidən öyrənirik ki, Allah ismi yalnız Rəbbimizə aid olan xüsusi addır. Allahı bizə tanıdan nə qədər ad və xüsusiyyət varsa hamısının bizə anlatmaq istədiyini Allah ismi təkbaşına anladır.

Allah haqqında bilməli olduğumuz ilk əsası Ayətəl-Kürsi bizə öyrədir: "Lə iləhə illəllah". Bu söz kəlmeyi-tövhiddir. Mənası belədir: "Allah birdir, onun tayı, bənzəri və şəriki yoxdur. Ondan başqa ilah yoxdur."

O, hayy və qəyyumdur. Hayy ismi ilə hər şeyə həyat

verəndir. Çünki həyatın sahibi odur. Hər şeyin bir sonu vardır, lakin Allah sonsuzdur. Hər bir canlı ölür, amma Allah ölümsüzdür. Qəyyum ismiylə yaratdıqlarını qoruyub mühafizə edir. Hər şey var olmaq üçün Allaha möhtacdır. Allah isə heç kəsə möhtac deyildir. Hər şey onun himayəsi ilə varlığını sürdürür.

Allah etdiyimiz bütün əməlləri və edəcəklərimizi bilir. Heç nə ondan gizli qalmaz. O, alimdir. Hər şeyi biləndir. Hətta xəyal etdiyimiz şeylər belə, Allahdan gizli qalmaz. Biz isə onun istədiyi qədər öyrənə bilərik. Onun kürsüsü göylərdə və yerdə olan hər şeyi əhatə etmişdir. Hər şey onun əmri altındadır. Çünki o, çox uca, çox böyükdür.



*Ey Rəbbimiz, biz həqiqətən (Sənə) iman gətirmişik, günahlarımızı bağışlayıb bizi cəhənnəm əzabından qoru!*

(Ali-İmran surəsi, 16-cı ayə)



## *Meracdan gələn hədiyyə: Bəqərə surəsinin son ayələri*

"Əmənər-rəsulu" kimi tanıdığımız bu ayələr sevimli Peyğəmbərimizə Merac zamanı nazil olmuş Bəqərə surəsinin 285-286-cı ayələridir. Bu ayələrin sonundakı dua belədir:

"Ey Rəbbimiz, (bəzi tapşırıqlarını) unutduqda və ya yanıldıqda bizi cəzalandırma! Ey Rəbbimiz, bizdən əvvəlkiləri yüklədiyin kimi, bizi ağır yükləmə! Ey Rəbbimiz, gücümüz çatmayan şeyi bizə yükləyib daşıtdırma! Bizi əfv edib bağışla, bizə rəhm et! Sən bizim ixtiyar sahibimizsən (mövlamızsan). Kafirlərə qələbə çalmaqda bizə kömək et!"

## *Rabbənə duaları*

Hər gün beş vaxt qıldığımız namazın sonunda Rabbənə dualarını oxuyururq. Bu dualarda belə deyirik:



"Ey Rəbbimiz, bizə dünyada da, axirətdə də gözəl nemətlər ver, bizi cəhənnəm əzabından qoru!" (əl-Bəqərə surəsi, 201-ci ayə)

"Ey Rəbbim! Haqq-hesab çəkilən gün (qiyamət günü) məni, ata-anamı və mö'minləri bağışla!" (İbrahim surəsi, 41-ci ayə)

## *Dua olaraq İxlas, Fələq və Nəs surələri*

İxlas, Fələq və Nəs surələrini dua kimi də oxuya bilərik. Bu surələrin mənası belədir:

"(Ya Peyğəmbər! Allahın zatı və sifətləri haqqında səndən soruşan müşriklərə) de: "(Mənim Rəbbim olan) O Allah birdir (heç bir şəriki yoxdur); Allah (heç kəsə, heç nəyə) möhtac deyildir! (Hamı Ona möhtacdır; O, əzəlidir, əbədidir!) O, nə doğmuş, nə də doğulmuşdur! (Allah Özünə heç bir övlad götürməmişdir!) Onun heç bir tayı-bərabəri (bənzəri) də yoxdur!"

"(Ya Peyğəmbər!) De: "Pənah aparıram sübhün Rəbbinə! Yaratdıqlarının (insanların, cinlərin, vəhşi heyvanların) şərindən; Zülmətə bürünməkdə olan gecənin (və ya: batan ayın, ziyası sönən ulduzların) şərindən; (Ovsun oxuyub) düyünlərə üfürən (yaxud: cadu edib iplərə düyün vuran) qadınların şərindən; Və bir də paxıllığı tutanda paxılın şərindən!"

"(Ya Peyğəmbər!) De: "Pənah aparıram insanların Rəbbinə; İnsanların ixtiyar sahibinə; İnsanların tanrısına; Vəsvəsə verən, (Allahın adı çəkiləndə isə qorxusundan) qaçıb gizlənən Şeytanın şərindən- O Şeytan ki, insanların ürəklərinə vəsvəsə salır, (O Şeytan ki) cinlərdən də olur, insanlardan da! [Və ya: (o Şeytan) istər cinlərdən olsun, istər insanlardan!]"



*Ey Rəbbim! Onlar (valideynlərim) məni körpəliyimdə (nəvazişlə) tərbiyə edib bəslədikləri kimi, Sən də onlara rəhm et!*

(əl-İsra surəsi, 24-cü ayə)







*Ey Rəbbimiz! Bizi və bizdən əvvəlki iman gətirmiş (din) qardaşlarımızı bağışla. Bizim qəlblərimizdə iman gətirənlərə qarşı kinə (həsədə) yer vermə. Ey Rəbbimiz! Sən, həqiqətən, şəfqətlisən, mərhəmətlisən!*

(əl-Həşr surəsi, 10-cu ayə)





## *Namazda oxunan dualar*

### Sübhanəkə duası

Sən nöqsan sifətlərdən uzaqsan. Allahım, səni daima tərif edirəm. Sənin adın mübarəkdir. Varlığın hər şeydən üstündür, şanın ucadır. Səndən başqa ilah yoxdur.

### Təhiyyat duası

Dil, bədən və mal ilə olunan ibadətlərin hamısı Allahadır. Ondan başqasına ibadət olmaz. Ey Peyğəmbər, Allahın salamı, rəhməti və bərəkəti sənə olsun! Salam bizə və yaxşı bəndələrinin üzərinə olsun! Mən şahidlik edirəm ki, Allahdan başqa ilah yoxdur. Yenə şahidlik edirəm ki, Hz. Məhəmməd onun qulu və elçisidir.

### Salli və Barik duaları

Allahım, İbrahim Peyğəmbərə və onun yaxınlarına rəhm etdiyin kimi, Məhəmmədə və onun yaxınlarına da rəhm et. Həqiqətən sən öyülən və şanı uca olansan.

Allahım, İbrahim peyğəmbərə və yaxınlarına xeyir-bərəkət verdiyin kimi, Məhəmmədə və ailəsinə də xeyir-bərəkət ver. Həqiqətən sən öyülən və şanı uca olansan.

### Qunut duaları

Allahım, ancaq səndən yardım istəyir, səndən günahlarımızı bağışlamanı və bizi doğru yola yönəltməni istəyirik. Sənə inanırıq, sənə tövbə edirik və ancaq sənə güvənirik. Bizə verdiyin bütün nemətləri bilərək səni xeyirlə öyürük. Sənə şükür edirik. Heç bir nemətini inkar etməz və onları başqasından görmərik. Nemətlərini inkar edəni və sənə asi olanı tərk edərik.

Allahım, ancaq sənə qulluq edərik. Namazı yalnız sənin üçün qılar, yalnız sənə səcdə edərik. Yalnız sənə dogru gələr

və sənə yaxınlaşdıracaq şeyləri qazanmağa çalışırıq. Sənə sevə-sevə ibadət edər və sənin rəhmətini umarıq. Əzabından da qorxarıq. Şübhəsiz ki, sənin əzabın inkar edənləri və imansızları yaxalayar.

## *Yolumuzu aydınladan peyğəmbər duaları*

İnsanlara doğru yolu anlatmaq üçün göndərilən peyğəmbərlər dua mövzusunda da insanlara nümunə olmuşlar. Biz də bu gözəl duaları əzbərləyib peyğəmbərlər kimi dua edə bilərik.

### Həzrət Adəm və Həvvanın duası

Həzrət Adəm və Həvva cənnətdən çıxarılıb dünyaya göndərildikdə xətalarından ötrü göz yaşı töküb belə dua etmişdilər:

"Ey Rəbbimiz! Biz özümüzə zülm etdik. Əgər bizi bağışlamasan, rəhm etməsən, biz, şübhəsiz ki, ziyana uğrayanlardan olarıq!" (əl-Əraf surəsi, 23-cü ayə)

### Həzrət Nuhun duası

"Mən (öz qövmümüm içində) məğlub oldum, buna görə də (onlardan) intiqam al!" (əl-Qəmər surəsi, 10-cu ayə)

"Ey Rəbbim! Bilmədiyim bir şeyi Səndən istəməkdən (belə bir işə cür'ət etməkdən) Sənə sığınıram. Əgər məni bağışlamasan, rəhm etməsən, ziyana uğrayanlardan olaram!" (Hud surəsi, 47-ci ayə)

### Həzrət İbrahimin duası

Bu gün milyonlarla insanın həcc və ümrə ibadətini yerinə yetirmək üçün ziyarət etdiyi Kəbəni Hz. İbrahim və oğlu Hz. İsmayıl minlərlə il bundan əvvəl Allahdan aldıqları vəhylə inşa etmiş və sonra belə dua etmişlər:



*Ey Rəbbimiz! Biz ancaq Sənə təvəkkül etdik, tövbə edib ancaq Sənə tərəf qayıtdıq. Axır dönüş də ancaq Sənin hüzurunadır.*
*Ey Rəbbimiz! Bizi kafirlər üçün sınaq vasitəsi etmə! (Bizi kafirlərin əli ilə sınağa çəkmə, onları bizim üstümüzdə hakim etmə!) Bizi bağışla.*
*Ey Rəbbimiz! Həqiqətən, Sən yenilməz qüvvət sahibi, hikmət sahibisən!*

(əl-Mumtəhinə surəsi, 4-5-ci





“Ey Rəbbimiz! (Bu xeyirli işi) bizdən qəbul et, Sən, doğrudan da, (hər şeyi) eşidənsən, bilənsən!” (əl-Bəqərə surəsi, 127-ci ayə)

Hz. Ibrahimin etdiyi başqa dualar da vardır:

“Ey Rəbbimiz! Bizim hər ikimizi Sənə itaətkar (müsəlman), nəslimizdən yetişənləri Sənə təslim olan ümmət (müsəlman) et, bizə (həcc) əməllərimizi (ibadət qaydalarımızı) göstər, tövbəmizi qəbul et! Həqiqətən, Sən tövbələri qəbul edənsən, mərhəmətlisən!”



“Ey Rəbbimiz! Onların (nəslimizin) içərisindən özlərinə elə bir peyğəmbər göndər ki, Sənin ayələrini (hökmlərini) onlara oxusun, (Sən göndərən) Kitabı (Quranı) və (oradakı) hikməti onlara öyrətsin, onları (günahlardan) təmizləsin! Həqiqətən, Sən yenilməz qüvvət, hikmət sahibisən.” (əl-Bəqərə surəsi, 128-129-cu ayələr)

“Ey Rəbbimiz! Mən əhli-əyalımdan bə’zisini (İsmaili və anası Hacəri) Sənin Beytülhəramının (Kə’bənin) yaxınlığında, əkin bitməz bir vadidə (dərədə) sakin etdim. Ey Rəbbimiz! Onlar (vaxtlı-vaxtında, lazımınca) namaz qılsınlar deyə belə etdim. Elə et ki, insanların bir qisminin qəlbləri onlara (Kə’bənin ziyarətinə, əhli-əyalıma mərhəmət göstərməyə) meyl etsin. Onlara (bu yerin ağaclarının) meyvələrindən ruzi ver ki, (ne’mətinə) şükür edə bilsinlər!

Ey Rəbbimiz! Sən bizim gizli saxladığımız və aşkar etdiyimiz hər şeyi (bütün gizli və aşkar əməllərimizi) bilirsən. Yerdə də, göydə də Allahdan gizli heç bir şey qalmaz!

İxtiyar çağımda mənə İsmail və İshaqı bəxş etmiş Allaha həmd olsun! Həqiqətən, Rəbbim duaları eşidəndir!

Ey Rəbbim! Məni də, nəslimdən olanları da (vaxtlı-vaxtında, lazımınca) namaz qılan et. Ey Rəbbimiz! Duamı qəbul buyur!

Ey Rəbbim! Haqq-hesab çəkilən gün (qiyamət günü) məni, ata-anamı və möminləri bağışla!" (İbrahim surəsi, 37-41-ci ayələr)

"Ey Rəbbim! Mənə hikmət (peyğəmbərlik, elm) bəxş et və məni (Sənin rizanı qazanmış) salehlərlə (yaxşılar zümrəsinə) qovuşdur! Sonra gələnlər arasında mənə yaxşı ad qismət elə! (Gələcək nəsillər məni həmişə yad etsinlər, xatirimi əziz tutub adımı hörmətlə çəksinlər!) Məni Nəim cənnətlərinin varislərindən et! Atamı bağışla! Şübhəsiz ki, o, (haqq yolu) azanlardan oldu!" (əş-Şuəra surəsi, 83-86-cı ayələr)

## Həzrət Lutun duası



Qurani-Kərimdə hökm və elm verilən peyğəmbər olaraq bəhs edilən həzrət Lut uzun illər haq dini təbliğ etmişdir. Lakin hz. Lutun qövmü günah işləməkdə israr edib ona meydan oxuduqda "Ey Rəbbim! Məni və ailəmi bunların gördüyü (pis) işdən (onların bəd əməllərinin cəzasından) qurtar!" (əş-Şuəra surəsi, 169-cu ayə) və "Ey Rəbbim! Fitnə-fəsad törədən qövmə qarşı mənə yardım et!" (əl-Ənkəbut surəsi, 30-cu ayə) -deyərək Allaha dua etmişdi. Allah bu duanı qəbul etmiş və elçisinə asi olan qövmü yox etmişdir.

## Həzrət Yaqubun duası

"Mən dərd-sərimi yalnız Allaha ərz edirəm..." (Yusuf surəsi, 86-cı ayə)

## Həzrət Yusufun duası

Yusuf surəsi Hz. Yusufun başına gələnləri anladan bir surədir. Bu surədə Hz. Yusufun gördüyü yuxu, qardaşları tərəfindən quyuya atılması, yoldan keçən bir karvan tərəfindən qurtarılması, Misir vəzirinə kölə kimi satılması, vəzirin xanımının ona aşiq olması, zindana atılması, Misir hökmdarının yuxusunu yozması, qıtlıq olması və qardaşları

ilə qarşılaşması, sonra onları bağışlaması və atasına qovuşması geniş şəkildə nəql olunur. Həzrət Yusufun qissəsində gözəl dua nümunələri vardır.

"Ey Rəbbim! Sən mənə səltənətdən (istədiyimdən də artıq) bir pay verdin. Mənə yuxu yozmağı öyrətdin. Ey göyləri və yeri yaradan! Sən dünyada da, axirətdə də mənim ixtiyar sahibimsən. Mənim canımı müsəlman olaraq al və məni əməlisalehlərə qovuşdur!" (Yusuf surəsi, 101-ci ayə)

## Həzrət Əyyubun duası



Hz. Əyyub amansız xəstəliyə yaxalanaraq uzun müddət əziyyət çəkmiş, ancaq hər şeyə səbir edərək bütün möminlərə nümunə olmuşdur. Biz də imtahanın şəkli və müddəti nə olursa-olsun əziyyətlərə sinə gərməli, üsyan etməməli və Allahdan ümid kəsməyərək səbrin gözəl nəticələr verəcəyini bilməliyik.

"Əyyubu da (yada sal)! Bir vaxt o, Rəbbinə yalvarıb dua edərək belə demişdi: "Mənə bəla üz verdi (Sənə pənah gətirdim). Sən rəhmlilərin rəhmlisisən!" (əl-Ənbiya surəsi, 83-cü ayə)

## Həzrət Şüeybin duası

Mədyən və Eykə xalqına peyğəmbər göndərilən Hz. Şüeyb iman edən digər möminlərlə birlikdə yaşadıqları torpaqlardan sürgün edilməklə təhdid edildi. Bu hal qarşısında Allaha təvəkkül edərək dua etdi:

"Allah bizi sizin (batil) dininizdən xilas etdikdən sonra biz sizin dininizə dönsək, (sizin bütpərəst dininizin haqq olduğunu etiraf etməklə) Allaha qarşı yalan uydurmuş olarıq. Rəbbimiz Allah istəməsə, biz əsla sizin dininizə dönə bilmərik. Rəbbimiz elm ilə (Öz əzəli elmi ilə) hər şeyi ehtiva etmişdir. Biz yalnız Allaha təvəkkül emişik. Ey Rəbbimiz! Bizimlə tayfamız arasında ədalətlə hökm et. Axı Sən hökm verənlərin ən yaxşısısan!" (əl-Əraf surəsi, 89-cu ayə)

## Həzrət Musanın duası

“Ey Rəbbim! Məni də, qardaşımı da bağışla. Bizi Öz mərhəmətin altına al. Sən rəhm edənlərin ən rəhmlisisən!” (əl-Əraf surəsi, 151-ci ayə)

“Bizə bu dünyada da yaxşılıq yaz. (Dünyada yaxşı əməllər, axirətdə Cənnət qismət elə). Biz (tövbə edib bağışlanmağımızı diləyərək) Sənə tərəf (hüzuruna) döndük!” (əl-Əraf surəsi, 156-cı ayə)

“Ey Rəbbim! (Peyğəmbərliyi yerinə yerinə yetirməyə qadir olmaq, Fir’onla danışmağa cür’ət etmək və bu yolda bütün məşəqqətlərə tab gətirə bilmək üçün) köksümü açıb genişlət; İşimi yüngülləşdir; Dilimdəki düyünü aç (pəltəkliyimi götür) ki, Sözümü yaxşı anlasınlar!” (Taha surəsi, 25-28-ci ayələr)



## Həzrət Süleymanın duası

“Ey Rəbbim! Məni bağışla və mənə elə bir mülk (səltənət) ver ki, məndən sonra (o cürəsinə) heç kəs nail ola bilməsin. Həqiqətən, Sən böyük ehsan (kərəm) sahibisən!” (Sad surəsi, 35-ci ayə)

“Ey Rəbbim! Mənə mənim özümə və ata-anama ehsan buyurduğun nemətə şükür etmək, Sənin razı qalacağın yaxşı iş görmək üçün ilham (qüvvət) ver! Və məni öz mərhəmətinə, saleh bəndələrinin zümrəsinə daxil et!” (ən-Nəml surəsi, 19-cu ayə)

## Həzrət Yunusun duası

“(Pərvərdigara!) Səndən başqa heç bir tanrı yoxdur. Sən paksan, müqəddəssən! Mən isə, həqiqətən, zalımlardan olmuşam (əmrinə qarşı çıxaraq özümə zülm eləmişəm)", - deyib dua etmişdi. Biz onun (Yunusun) duasını qəbul buyurduq və (balığın qarnından çıxartmaqla) onu qəmdən qurtardıq. Biz möminlərə belə nicat veririk!” (əl-Ənbiya surəsi, 87-88-ci ayələr)

## Həzrət Zəkəriyyanın duası

Zəkəriyya Peyğəmbər olduqca yaşlanmışdı. Xanımı da qısır idi. Bu hal qarşısında Hz. Zəkəriyya özündən sonra qövmü içərisində imanı təbliğ edəcək bir övlad istədi.

“(Zəkəriyyaya) Rəbbinə gizlicə dua edib yalvardığı zaman belə demişdi: "Ey Rəbbim! Artıq sümüyüm sustalmış, başım ağappaq ağarmışdır. Ey Rəbbim! Sənə dua etməklə heç vaxt naümid olmamışam. (Nə dua etmişəmsə, qəbul olunmuşdur). Mən özümdən sonra gələn qohum-əqrabamdan (yerimə keçəcək əmioğlularımın və digər vərəsələrimin məsləkimi ləyaqətlə davam etdirməyəcəyindən) qorxuram. Zövcəm də ki, qısırdır. Buna görə də mənə Öz dərgahından bir oğul (vəli) bəxş et ki, o həm mənə, həm də Yəqub nəslinə (onlara lütf edilmiş peyğəmbərliyə) varis olsun. Ey Rəbbim! Həm də elə et ki, o (öz əqidəsi, itaəti və gözəl axlaqı ilə) riza (Sənin rizanı) qazanmış olsun!” (Məryəm surəsi, 3-6-cı ayələr)



“Biz (Zəkəriyyanın) duasını qəbul buyurduq, ona Yəhyanı bəxş etdik və zövcəsini (doğmağa) qabil bir hala gətirdik. Onlar xeyirli işlər görməyə tələsər (yaxşı əməllər etməkdə bir-birini ötməyə çalışar), ümid və qorxu ilə (rəhmətimizə ümid bəsləyib əzabımızdan qorxaraq) Bizə ibadət edirdilər. Onlar Bizə müti idilər.” (əl-Ənbiya surəsi, 90-cı ayə)

## Həzrət İsanın duası

“(Ya Rəsulum!) Xatırla ki, o zaman (qiyamət günü) Allah belə buyuracaq: "Ya Məryəm oğlu İsa! Sənmi insanlara: "Allahla yanaşı, məni və anamı da özünüzə tanrı bilin!" - demişdin? "(İsa cavabında) deyəcək:" Sən pak və müqəddəssən! Haqqım çatmayan bir şeyi demək mənə yaraşmaz. Əgər bunu mən demiş olsaydım, Sən onu mütləq bilərdin. Sən mənim ürəyimdə olan hər şeyi bilirsən, mən isə Sənin zatından ola bilmərəm. Şübhəsiz ki, qeybləri bilən ancaq Sənsən!

Mən onlara yalnız Sənin mənə etdiyin əmri çatdırıb belə demişəm: "Mənim də, sizin də Rəbbiniz olan Allaha ibadət edin!" Nə qədər ki, onların arasında idim, onlara şahid mən idim (onları belə nalayiq hərəkətlər etməyə qoymurdum). Sən məni (göyə qaldırıb dərgahına) qəbul etdikdən sonra onlara nəzarətçi Özün oldun. Yalnız Sən hər şeyə şahidsən!

Əgər onlara əzab versən, şübhə yoxdur ki, onlar Sənin qullarındır. Əgər onları bağışlasan, yenə şübhə yoxdur ki, Sən yenilməz qüvvət sahibi, hikmət sahibisən" (İstədiyin bəndəyə əzab verməyə, istədiyini bağışlamağa və hər hansı bir məsələni hakimanə həll etməyə qadir olan ancaq Sənsən!)" (əl-Maidə surəsi, 116-118-ci ayələr)



## *Həzrət Məhəmməd (s.ə.s)-in Qurani-Kərimdə keçən bəzi duaları*

Qurani-Kərimdə Peyğəmbərimizə aid olan duaların demək olar ki, hamısı "de ki" və ya "söylə" şəklində başlamaqdadır. Rəbbimiz həzrət Peyğəmbərimizə də necə dua edəcəyini təlim etmişdir.

"Və de: "Ey Rəbbim! Mən şeytanların vəsvəsələrindən Sənə sığınıram! Onların yanımda olmalarından (işlərimə xələl qatmalarından) Sənə pənah gətirirəm, ey Rəbbim!" (əl-Muminun surəsi, 97-98-ci ayələr)

"Ey Rəbbim! Məni daxil edəcəyin yerə (Mədinəyə) xoşluqla daxil et, məni çıxaracağın yerdən (Məkkədən) də xoşluqla çıxart. Öz dərgahından mənə kömək edə bilən bir dəlil ver!" (Mənə elə bir qüdrət ver ki, müşriklər və kafirlər həmişə onun qarşısında aciz qalsınlar!)" (əl-İsra surəsi, 80-ci ayə)

"Ey Rəbbim! Mənim elmimi artır! - de" (Taha surəsi, 114-cü ayə)

"Ey Rəbbim (Bizi) bağışla və rəhm et! (Ümmətimin gü-

nahlarından keç, tövbəmizi qəbul buyurmaqla bizə mərhəmət əta et!) Sən rəhm edənlərin ən yaxşısısan!” (əl-Muminun surəsi, 118-ci ayə)

## *Peyğəmbərimizin həyatından daha bir neçə dua*

Peyğəmbərimiz həm ibadət edərkən, həm də gündəlik həyatı boyunca kədərli və sevincli anlarında hər zaman əl açar, Allaha yönələr, davamlı olaraq ona yalvarardı:



“Allahım, nəfsimi sənə təslim etdim. Üzümü sənə çevirdim. İşimi sənə həvalə etdim. Rizanı umaraq, əzabından qorxaraq sənə arxalandım. Sənə sığındım. Səndən başqa sığınacaq, səndən başqa dayaq yoxdur. Allahım endirdiyin kitabına, göndərdiyin peyğəmbərinə iman etdim!” (Buxari, Dəavat 7)

“Ey Allahım, səni sevməyi, sevdiklərini sevməyi və sevginə aparacaq əməlləri nəsib etməni səndən diləyirəm. Ey Allahım, sevgini mənə nəfsimdən, ailəmdən və soyuq sudan daha sevimli et!” (Tirmizi, Dua 73)

“Allahım, bizə dünyada və axirətdə gözəlliklər ver!” (Müslim, Zikr 26)

“Allahım, məni bağışla, mənə mərhəmət et, rizanı qazandıracaq işlər gördür, mənə sağlamlıq və xeyirli ruzi ver!” (Müslim, Zikr 35)

“Allahım, məni doğru yola yönəlt və o yolda müvəffəq et!” (Müslim, Zikr 78)

“Ey Allahım, pis əxlaqlı olmaqdan, pis işlər görməkdən və batil inanclara sürüklənməkdən sənə sığınıram!” (Tirmizi, Dua 126)

“Allahım, verdiyin nemətin yox olub çəkilməsindən, verdiyin sağlığın pozulmasından, ansız verəcəyin cəzadan və

qəzəbini üstümə cəlb edəcək hər şeydən sənə sığınıram!" (Müslim, Zikr 96)

"Allahım, acizlikdən, tənbəllikdən, qorxaqlıqdan, ixtiyarlıqdan, qəbir əzabından, dirilərin və ölülərin fitnəsindən sənə sığınıram!" (Müslim, Zikr 50)

"Allahım, fayda verməyən elmdən, ürpərməyən qəlbdən, doymayan nəfsdən, qəbul olunmayan duadan sənə sığınıram!" (Müslim, Zikr 73)

"Allahım, səndən hidayət, təqva, iffət və könül zənginliyi istəyirəm!" (Müslim, Zikr 72)

"Ey Rəbbim, məni yaxşılıq etdiyi zaman sevinən, pislik etdiyi zaman peşman olanlardan eylə!" (İbn Macə, ədəb 57)



## *İslam böyüklərindən dualar*

"Allahım, səndən bütün gözəllik və yaxşılıqları istəyirəm. Bütün çirkinlik və pisliklərdən də sənə sığınıram!" (Həzrət Aişə)

"Allahım, mənə yaxşı işlər görməyi nəsib et! İşlərimi rizana məxsus eylə, yalan və riyadan uzaq tut!" (Həzrət Ömər)

"Ya Rəbb, halımı görürsən, çarəsizliyimi bilirsən. Gizli yalvarışımı eşidirsən. Məni səndən ümid kəsənlərə qatma, qüsurlarımı bağışla, daha çox gözlətmə, ümidsizliyə atma! Rəhmətinə güvənim tamdır. Qəlbimdəki eşq atəşini yandır, məni sevginlə doyur, sevgini əskik etmə! Sənin böyüklüyün önündə boyun əydim, səcdəyə qapandım, məni bağışla!" (Həzrət Əli)

"Zikr edəni unutmayan Allaha həmd olsun! Dua edəni əliboş qaytarmayan, yalvaranı ağlatmayan və ümid edəni ümidsiz qoymayan Allaha həmd olsun!" (Həzrət Həsən)

“Ən pis yoldaş olan aclıqdan və xəyanətdən sənə sığınıram. Tənbəllik, paxıllıq, qorxu və hədsiz qocalıqdan sənə sığınıram. Həyatın və ölümün fitnəsindən sənə sığınıram!” (İmam Qəzali)

“Allahım, daxilimizi səndən başqasının sevgisinə məkan olmaqdan təmizlə!” (Əbdülqadir Geylani)

“Ya Rəbb, dua da səndəndir, duanın qəbulu da səndəndir. Dua və yalvarışımızda sənə layiq olmayan sözləri dilə gətirib xəta etmişsək, özün o kəlmələri islah et və qəbul buyur! Çünki sözlərin hakimi və sultanı sənsən.”

“Ey Rəbbim, mən vücudumu pisliklərdən yuyub təmizlədim, pakladım. Sən də içimi pisliklərdən təmizlə.” (Mövlana)

“Ya Rəbb, biz başqasının deyil, yalnız Sənin rəbb olduğunu qəbul edər və ancaq Sənə boyun əyərik. Yalnız Sənə itaət edərək könül rahatlığı taparıq. Çünki bütün qorxu və ümidimizin ilk və son qaynağı yalnız Sənsən. Sən qorxu verməzsən, qorxu yox, ümid verməzsən, ümid də yox. Sən həzz vermədikdən sonra hər şey kədər, sən kədər vermədikdən sonra hər şey həzdir.” (Muhammed Hamdi Yazır)





## *Oxu...*

**BISMILLAH**

Allahtır ilk sözümüz,
İman dolu özümüz.

İşler Allah adıyla
Başlar, biter tadıyla.

Uyanırken her sabah
Derim hemen bismillah!

Bir şey yerken, içerken,
Kitabımı açarken...

Çekerim hep besmele,
Unutmam bir kez bile.

Yönelirim Rabbime
Kuvvet gelir kalbime.

Allahla az, çok olur,
Güçlükler hep yok olur.

Başarıyla el ele
Verir, çeken besmele.

Düşürmem hiç dilimden,
Allah tutar elimden.

*Mustafa Asım Köksal*





## YATARKƏN

Yatdım sağıma, döndüm soluma
Sığındım Allahıma
Mələklər şahid olsun
Dinimə, imanıma.

Yatdım Allah qaldır məni
Nur içinə daldır məni.
Can bədəndən ayrılarkən
İman ilə göndər məni.

ÜÇÜNCÜ FƏSİL

# SƏN DƏ DUA ET!



## *Dua ilə təşəkkür etmək: Allah razı olsun*

Bizə yaxşılıq və xeyirxahlıq edən bir adama təşəkkür etmək istəyərik. Xüsusilə bu yardım bizə çətin anımızda edilmişsə, daha dərin təşəkkür etmək istəyərik. Əslində o yaxşılığı bizim qarşımıza çıxaran Rəbbimizdir. İnsanlara təşəkkür etmək də, elə Allaha təşəkkür sayılır. Bunu edərkən Rəbbimizə də təşəkkür etmiş sayılırıq. Bunu edərkən bir tərəfdən də Rəbbimizə dua etmiş sayılırıq və beləliklə təşəkkürümüz daha da gözəlləşir. Bunu gerçəkləşdirməyin bir yolu vardır, o da "Allah razı olsun" deməkdir.

"Allah razı olsun" bir çox təşəkkür cümləsinin yerinə işlənə bilər. Məsələn, Allah razı olsun demək "Ay ana, yemək çox gözəl olub. Əllərin dərd görməsin!" deməkdir.

"Atacan, verdiyin cibxərcliyi üçün çox təşəkkür edirəm" deməkdir.

"Dostum, pozanından istifadə etməyə icazə verdiyinçün sağ ol! Məni pis vəziyyətdən qurtardın" deməkdir.

"Qapımızın önünü zibildən təmizlədiyin üçün təşəkkür edirəm, dayıcan; oynayıb qurtardıq, necə də yaxşı oynadıq dostlar, müəllimə, bizə çox mühüm şeylər öyrədirsiniz, təşəkkür edirik" deməkdir.

"Mənə etdiyin bu yaxşılıq üçün Allah da sənə yardım etsin. Səni çətin anda tərk etməsin, ehtiyaclarını həll etsin, səni sevsin" deməkdir.

Biz də sizə "Allah hamınızdan razı olsun" deyirik. Çünki çox gözəl iş görürsünüz, kitab oxuyursunuz.



## *Yuxudan qalxdıqda və yatmaq üçün*

Hər səhər yuxudan duraraq yeni günə başlayırıq. Günəş yavaş-yavaş göy üzündə yüksəlir, quşlar nəğmə oxur. İnsanlar küçələrdə qarışqa kimi qaynaşır.

Yastığımızdan başımızı qaldırıb yeni günə başladığımız zaman artıq dünya bizim üçün hazır hala gəlmiş olur. Bu yeni günə dua ilə ən gözəl şəkildə başlaya bilərik.

Allahım! Bu gözəl gündə mənim oyanıb qalxmamı təmin etdiyin üçün sənə həmd olsun! Vücudumu sağlam qıldığın üçün sənə şükürlər olsun! Bu günümü yaxşılıqlarla doldur! Bizi sabaha qovuşdurduğun kimi axşama da xeyirlə qovuşdur! Buna bənzər bir dua ilə, ya da Peyğəmbərimizin oxuduğu və tövsiyə etdiyi bir duanı oxuyaraq yeni günə başlaya bilərik.

Səhər qalxarkən günə dua ilə başladığımız kimi, yatağa girib yuxuya dalarkən də günümüzü dua ilə bitirəriksə çox gözəl olar. Bununla iki dua arasında keçirdiyimiz günümüz bizə faydalı hala gələcəkdir.

"Allahım! Sənin yardımınla axşama çıxdıq. Bütün pisliklərdən və dərd-bəladan sənə sığınıram! Yaxşı əməllərimi qəbul et, qüsurlarımı əfv et! Oyandığım zaman mənə bugünkündən də gözəl bir gün nəsib et!" - deyə dua edə bilərik. İstədiyimiz şəkildə də dua etmək olar. Peyğəmbərimizin tövsiyə etdiyi Quranın son üç surəsini İxlas, Fələq və Nəs surələrini üç dəfə oxuya bilərik.

## *Pisliklərə qarşı qalxan olması üçün*



Bu dünyada bəzən əxlaqsız insanlarla və ya pisliklərlə qarşılaşa bilərik. Belə hallarda güclü olmalı, pisliyi düzəltməyə çalışmalı, səbirli olmalı və Allahdan yardım istəməliyik. Allahın hər şeyə gücü çatar. O, bizi qoruyarsa, heç kim bizə zərər verə bilməz. Elə isə ondan bizi və sevdiklərimizi pisliklərdən və əxlaqsız insanlardan qorumasını istəməliyik. Bizi yaxşı insanlarla qarşılaşdırmasını və dürüst insan olmamız üçün dua etməliyik.

## *Dualar qorxuları dəf edər*

Bəzən bilmədiyimiz, bəzən də bilib sevmədiyimiz şeylərdən qorxarıq. Qorxduğumuz zaman diqqətimiz dağılır, titrər, tərlər və ağlarıq. Əslində sakitləşdikən sonra o qədər də qorxulu bir şey olmadığını görərik. Qorxudan xilas olmaq üçün onun keçməsini gözləmək yerinə Allaha dua edərək rahatlaya bilər və hər şeyə gücü yetən Rəbbimizin yardımını istəyə bilərik.

Bilirik ki, Rəbbimiz hər şeyi görür və eşidir. Qorxduğumuz zaman nə qədər kədərləndiyimizi və özümüzü pis hiss

etdiyimizi də bilir. Bizdən qorxunu yalnız o dəf edər və bizi ancaq o qoruyar. Bizə daxili rahatlıq verən də odur. Ona dua edərkən qorxulardan xilas ola bilərik.

## *Qəmləri və kədəri aradan götürür*

Həyatda qüssəli və kədərli anlarımız ola bilər. Dərdi verən Allah dərmanı da verər. Belə hallarda Allaha sığınmalı, dua etməli və kədərimizi aradan qaldıracaq işlərlə məşğul olmalıyıq. Qəlbimizi fərəhləndirmək üçün hər zaman dua edə bilərik.



Göylərin və yer üzünün sahibinin Rəbbimiz olduğunu, ondan yardım istəsək bizə yardım edəcəyini, ona dua edərək üzüntü və sıxıntılardan xilas olacağımızı bilirik.

"Ey Rəbbimiz, sənin gücün hər şeyə çatar. Dərd-qəmimizin aradan qalxması üçün sənə yalvarırıq. Bilirik, səsimizi eşidirsən, bizə yardım et!" deyə dua edə bilərik. Qurandan öyrənəcəyimiz şəfa və dua ayələrini oxuya bilərik. Belə etsək Rəbbimiz bizə yardım edər və bizi hər cür qəmdən, kədərdən qoruyar.

## *Şübhələrdən xilas olmaq üçün*

Hər mövsümün özünəxas xüsusiyyətləri var. Yazla qış birbirindən çox fərqlidir. Məsələn, duman çöküb, göz-gözü görməz olduqda nə qədər çətinlik çəkdiyimizi hamımız bilirik. Belə hallarda bəzən bir neçə addımlığımızdakı dirəyi və ya çökəyi görməyə bilirik. Əslində şübhə də buna bənzər. Şübhəyə düşdüyümüz zaman önümüzü açıq-aydın görə bil-

mirik. Belə hallarda sağlam qərarlar ala bilmərik və xətaya düşmə ehtimalımız artar. Bu səbəblə belə hallarda mütləq Allaha sığınmalı və ondan yardım istəməliyik. Bizi məşğul edən şübhələrdən qurtulmaq üçün dua etməliyik.

"Hər şeyə gücü çatan Rəbbim! İçimdəki şübhələri dağıt. Qəlbimi fərəhləndir. Şübhələr içində itib-batmaqdan məni qoru. Hər işdə sənin rizanı qazanmağı, gələcəyim üçün faydalı qərarlar almağı mənə nəsib et. Sonrakı peşmanlıqlardan və bilmədən özümə zərər verməkdən məni qoru!" - deyərək və ya başqa cümlələrlə dua edə bilərik.



## *Şəfa üçün*

Həyatımızın çox hissəsi sağlıqlı keçir. Lakin buna baxmayaraq bəzən xəstəliyə də düçar oluruq. Xəstəliyin şiddətinə görə çox acı çəkə və sıxıntılı anlar keçirə bilərik. Xəstəliyi verən Allah əlbəttə ki, şəfasını da vermişdir. Buna görə də xəstə olduqda həkimə gedib müalicə olunmağı və sağalmağı düşünürük. Eyni zamanda Allaha dua etməliyik ki, həm xəstəliyimizə, həm də içimizdəki sıxıntılara, insanların bilmədiyi acılarımıza çarə olsun. Çünki maddi və mənəvi xəstəliklərimizə şəfa verən odur. Buna görə də özümüzü halsız hiss etdikdə, sağlığımıza qovuşmaq istədikdə dua etməliyik.

"Uca Allahım, sən şəfası olmayan xəstəlik verməzsən. Hər dərdin dərmanını da yaradarsan. Xəstəliklərimə şəfa ver. Xəstəlikdən xilas olmağı, sağlam olmağı və sağlamlığın qədrini bilməyi mənə nəsib et!" -deyə dua edə, Quranda və hədislərdə keçən şəfa və dua ayələrini oxuya bilərik.

## *İstəklərim var*

İnsanın arzularının yazı-qışı, gecəsi-gündüzü, böyüyü-kiçiyi yoxdur. Yerinə gətirildiyi zaman sevinirik, gecikdiyi zaman qəlbimiz narahat olur, lakin başımıza gəlmədən də xeyirli olub-olmadığını fərq edə bilmirik. Ürəyimizdə gizli saxladığımız hər bir istəyimizi bilən, bizim üçün hər zaman ən yaxşısını istəyən Rəbbimiz vardır. O, istəklərimizi bilsə də bizim onları Özünə açmamızı və Ondan yardım istəməyimizi sevər. Biz də bütün ehtiyaclarımızı ona açar və haqqımızda xeyirlisini istəyərik. Bir şey istədikdə dua edər, onun həyata keçməsini istəyərik.



“Ey uca Allahım, sən özünə doğru açılan əlləri boş qaytarmazsan. Mən də səndən yardım istəyirəm. Əlimdən gələn hər şeyi etdim, indi isə səndən xeyirli nəticə istəyirəm. Məni muradıma qovuşdur. Qəlbimi üzəcək, mənə zərər verəcək şeyləri məndən uzaq tut. Sən istəklərimi və nəticəsini gözəl eylə!” -deyərək və ya bu kimi cümlələrlə diləklərimizi Rəbbimizə ərz edə bilərik.

## *Babalar, nənələr və qohumlar üçün*

Bildiyiniz kimi ata-anamızıdan başqa ailəmizi meydana gətirən başqa böyüklərimiz də vardır. Xeyirli övlad, xeyirli nəvə, xeyirli qohum olmaq üçün onları dualarımızda unutmamalıyıq. Şübhəsiz ki, böyükərimizin bizim üzərimizdə haqları vardır. Allahın bizdən razı olmasını istəyiriksə onlara qarşı yaxşı davranmalı, onlara xidmət etməli və könüllərini fərəhləndirəcək əməllər etməliyik. Onlara dua etməli və dualarını almağa çalışmalıyıq. Onların bizdən razı qalması

Allahın da xoşuna gələcək, beləcə onlar da bizə xeyir-dua edəcəklər. Ailə böyüklərimiz üçün dua etməyi unutmamalıyıq.

"Ey uca Allahım, məni kiçiklərimə qarşı mərhəmətli, böyüklərimə qarşı sayğılı insan et! Böyüklərimə faydalı ola bilməyi, onların məndən razı qalmasını lütf eylə! Sən də məndən razı ol!" -deyə və ya buna bənzər cümlələrlə qohumlarımız üçün dua edə bilərik.

## *Bu dünyadan köçdülər, amma hələ də qəlbimizdədirlər*



Hər saniyə dünyaya körpələr gəldiyi kimi, həmin anda ölən insanlar da vardır. Biz bilirik ki, ölənlər yox olmurlar, yeni bir həyata başlayırlar. O həyatın başlanğıcında hər kəsin yaxşı və pis əməlləri ölçülür və bunların qarşılığı verilir. Yaxınlarımızdan da ölənlər vardır təbii ki. Ayrılıq çətin olsa da onların bu dünyadan daha gözəl bir yerdə yaşadıqlarını düşünərək özümüzə təsəlli verə, qəlbimizi rahat edə bilərik. Yenə də onlar üçün dua edə bilərik. Bununla da onlara olan sevgimizin hələ də davam etdiyini və onların yaxşılığını istədiyimizi göstərmiş olarıq.

"Ey uca Rəbbim, canımızı bizə əmanət olaraq verən sənsən. Vaxtı çatanda onu bizdən alan da sənsən. Həyatımız boyunca sevdiyin insan kimi yaşamağı bizə nəsib et!

Allahım, həyatda olmayan bütün sevdiklərimə və yaxınlarıma rəhmət et, onlara cənnət nemətlərindən ver!" - deyə və ya bu kimi cümlələrlə dünyadan köçmüşlərimizə dua edə bilərik.

## *Ata-ana və bacı-qardaş üçün*

Ailənizdən uzaq qaldınızmı heç? Uzaq qalıb darıxdığımız zamanlarda bəzən səhvən incitdiyimiz ailə üzvlərimizin bizim üçün nə qədər qiymətli olduğunu anlayırıq. Insan belə bir varlıqdır. Əlindən çıxmadıqca sahib olduğu nemətlərin qədrini lazımınca bilməz. Halbuki yanımızda olan ailəmiz sevgi və hörmətə ən çox layiq olan insanlardır. Ata-anamız və bacı-qardaşlarımızla hörülmüş bir divarın kərpicləri kimi-yik. Bir kərpicin zərər görməsi bütün divara təsir edər, lakin divar sağlam olarsa bir kərpiclə sarsılmaz. Onlar bizimlə sevinir, bizimlə kədərlənirlər. Ailəmizi xoşbəxt edəcək insan olmaq, dualarımızda onlara yer ayırmaq vəfa borcumuzdur. Onlara qarşı yaxşılıqlarımızdan biri də dua etməkdir. Heç bir zaman dualarımızda onları unutmamalıyıq.



“Ey aləmlərin Rəbbi olan Allahım, məni yetişdirib böyüdən ata-anama mərhəmət et! Onlar məni qoruduqları kimi, sən də onları qoru. Həm dünyada, həm də axirətdə ailəmə yaxşılıq, gözəllik və nemətlər nəsib et! Məni, anamı, atamı, bacı-qardaşlarımı və sevdiyim hər kəsi pisliklərdən qoru. Bizi bir-birimizə qarşı mərhəmətli eylə!” - deyə və ya bu kimi cümlələrlə dua edə bilərik.

## *Dostumuz canımızdır*

Hər halda ailəmizdən sonra özümüzü yanında ən rahat hiss etdiyimiz, dərdlərimzə və sevinclərimizə şərik olan insanlar dostlarımızdır. Yaxşı və pis günlərimizdə yanımızda olması-

nı istədiyimiz və bir çox gözəllikləri paylaşdığımız dostlarımıza da dua etməliyik.

“Allahım, məni yaxşı insanlarla dost et. Məni dostlarımın yanında sevilən və etimad olunan insan et. Aramıza kin, düşmənçilik, qısqanclıq salma. Bir-birimizə qarşı mərhəmətli olmağı və bir-birimizi sevməyi nəsib et!” - deyə və bu kimi cümlələrlə dua edə bilərik.

## *Evdən çıxarkən və evə girərkən*



Evlərimiz ailəvi olaraq yaşadığımız, özümüzü əmin hiss etdiyimiz məkanlardır. Evdən çıxarkən “Əuzu billəhi minəş-şeytanir-racim, Bismilləhir-rahmənir-rahim” deyərək çıxarıqsa qarşılaşa biləcəyimiz hər cür çətinliklərdən və bəlalardan Allaha sığınmış olarıq. Rəbbimizdən yardım istəmək özümüzü yaxşı hiss etdirər. Evə girərkən də Allaha dua edib hər an onun bizi qorumasını istəyə bilərik.

“Ey hər şeyə gücü yetən Allahım! Bütün pisliklərdən, pis insanların şərindən, qəza və bəlalardan sənin himayənə sığınıram. Evimə qayıdana qədər hər hansı bir pisliklə qarşılaşmaqdan, pis iş görməkdən, gördüyüm və görmədiyim hər bir çətinlikdən məni qoru!” deyə dua etməliyik.

“Bismilləhir-rahmənir-rahim, ey uca Rəbbim! Bizə rəhmət və bərəkət qapılarını aç, bizə sağlıq, xoşbəxtlik və nizam-intizam ver, evimizi bərəkətləndir. Dərdləri, qüssələri, münaqişələri evimizdən uzaq tut. Ailəmizi xoşbəxt və bərəkətli eylə” -deyərək də dua edə bilərik.

## *Məktəbə gedərkən ən səmimi yoldaş*

Məktəb partalarına oturmağa başladığımız gündən etibarən oxuyub-yazmağı, vurma-bölməni, paralelləri və meridianları öyrənirik. Öyrənə-öyrənə sürətli bir yarışın içinə giririk. Hər gün yeni bilgilərlə qarşılaşır və bildiklərimizin sınaqdan keçirilməsi üçün imtahanlara giririk. Bəzən yazılı, bəzənsə şifahi imtahanlar... Hətta getdikcə bu imtahanlar çətinləşir, minlərlə adamın iştirak etdiyi imtahanlara çevrilir. Bütün çətinliklərə baxmayaraq məktəbə getmək gözəldir. Xüsusilə də məktəbə gedərkən dua ilə yola çıxarıqsa, atdığımız hər bir addım və məktəbdə keçən hər saat daha da gözəlləşir. Məktəbə gedərkən dua etməyi unutmamalıyıq.



"Allahım, mənə zehn açıqlığı ver, qavrama qabiliyyətimi gücləndir! Məni dərslərimdə müvəffəq et, elmimi artır! Dünyada və axirətdə faydalı olacaq bilikləri asanlıqla öyrənməmə yardım et!" - deyərək dua edə və istəklərimizi ona ərz edə bilərik.

## *Ən böyük müvəffəqiyyət*

Qəlbimizə sevinc verən duyğulardan biri də müvəffəqiyyət əldə etməkdir. Əldə etdiyimiz nailiyyətlər bəzən böyük mükafatlarla təltif olunur. Bəzən də bir təbəssüm o sevinci bizə yaşatmağa kifayət edir. Ən mükəmmələ nail olduğumuza əvvəlcə özümüz inanmalıyıq. Müvəffəqiyyətə gedən yolda heç bir vaxt cəhd göstərməkdən vaz keçməməliyik. Nəticə pis olsa belə, çalışmağa davam etməliyik. Çünki müvəffəqiyyət çalışmağa davam etmək, əzm və cəhdi əldən

buraxmamaqla mümkündür. Sonda bizi gözləyən mükafat nə olursa-olsun heç biri Rəbbimizin razılığından böyük ola bilməz. Onun verdiyi mükafatlar həm dünyada, həm də axirətdə keçərlidir.

"Allahım, öhdəmizə götürdüyümüz hər məsuliyyəti müvəffəqiyyətlə yerinə yetirməyi bizə nəsib et! Yolumuza çıxan əngəlləri aşa bilməyi və çalışqan ola bilməyi lütf et! Mərhəmətini üstümüzdən əskik etmə və hər zaman bizə yardım et! Məni təkəbbürdən, özünü bəyənməkdən qoru" - deyə və bu kimi cümlələrlə dua edə bilərik.



## *Asanlaşsın*

Bəzən çətinliklər bizi daha da güclü edər. Çünki onlara sinə gərərkən və onların öhdəsindən gəlməyə çalışarkən özümüzü inkişaf etdiririk. Yeni metodlar öyrənir və mücadilə etmək ruhu qazanırıq. Lakin gündəlik həyatımızda qarşımıza çətinliklərin çıxmasını istəmirik. Yenə də heç nəyin asanına qaçmadan, işlərimizdəki çətinliklərin aradan qalxması və əzmimizin azalmaması üçün dua edə bilərik. İşlərimizin asanlaşması üçün belə dua edə bilərik:

"Rabbi yəssir və lə tuassir, Rabbi təmmim bil-xayr."

"Rəbbim, işlərimi asanlaşdır, çətinləşdirmə. Bu işi xeyirlə kamala çatdır!"

## *Səfərdə dua*

Bəzən qısa, bəzən də uzun səfərlərə çıxırıq. Bu səfərlər bə-

zən bir-iki saat, bəzən də bir neçə gün çəkə bilir. Ayrıldığımız yerlə gedəcəyimiz yer arasındakı məsafə nə qədər olursa-olsun, yolda olmağın özünə məxsus bəzi çətinlikləri var. Əlbəttə, dua edərək bu çətinliklərin aradan qalxması üçün Rəbbimizdən yardım istəyə bilərik. Beləliklə özümüzlə apar-madığımız hər şeyimizi də əmin əllərə təslim etmiş olarıq.

"Ey ucalardan uca olan Rəbbim, səndən yardım istəyirəm, sənə arxalanıram, səfərimi asanlaşdır, məni qəzalardan və bəlalardan mühafizə et! Yaxşılıqlar və gözəlliklər nəsib et. Qəlbimə fərəhlik ver və işimi asanlaşdır.



Ey Rəbbim, məni, dinimi, ailəmi, qohum-əqrəbamı və hər şeyimi sənə əmanət edirəm. Bizi hər cür pislikdən qoru.

Ey gözəl Allahım, gedəcəyimiz yerə bizi sağ-salamat çat-dır!" -deyərək dua edə bilərik.

## *Yedik-içdik, Rəbbimizə çox şükür*

Bildiyimiz kimi dünyanın bir çox yerində ac insanlar var-dır. Bəzi uşaqlar yemək tapmadıqları üçün yeriməyə başla-madan aclıqdan ölürlər. Atalarımız bizim ehtiyaclarımızı qar-şılamaq üçün, analarımız evin səliqə-səhmanı üçün çalışır və bizə çeşidli yeməklər bişirmək üçün mətbəxdə saatlarla işl-əyirlər. Buna baxmayaraq yemək bəyənməyən uşaqlar var. Halbuki o yeməklər nə zəhmətlər bahasına meydana çıxır. Ona görə də yeməyə "Əuzu-bəsmələ" ilə başlamalıyıq. Yeməkdən sonra da Allaha şükürlə dua etməliyik.

"Ey bizi yedirən, içirən və yaşadan Rəbbim! Verdiyin

nemətlərə həmd olsun, bizə xeyirli ömürlər və halal nemətlər bəxş et. Can sağlığı ver!" deyərək yeməkdən sonra dua etməyi vərdiş halına gətirməliyik.

## *Bərəkət istəyərkən*

Kifayət qədər olmayan hər şeyin bərəkətlənməsini istəyərik. Bərəkət sirli bir çoxalma, artmadır. Bərəkət kifayət qədər olmayan yeməyin artması, hər kəs doyduqdan sonra belə, artıq qalmasıdır. Həyatımızdan bərəkət əskilərsə yediyimizdən, içdiyimizdən və zamanımızdan heç bir fayda ala görmərik. Ömrümüzün bərəkətlənməsi, gördüyümüz işlərdə bərəkətin əskik olmaması və qiymətlənməsi üçün də dua edərik.



"Ey Allahım, qüdrət sənin əlindədir. Sən azımızı çox eylə. Əlimizdəkini bərəkətləndir. Yeyib-içdiyimizi və geydiyimizi bərəkətləndir. Həyatımızdan, sevgimizdən, evlərimizdən və süfrələrimizdən bərəkəti çəkmə!" deyə bu və buna bənzər cümlələrlə Rəbbimizə əl açaraq, ya da ürəyimizdə dua edə bilərik.

## *Qəza və fəlakətlərə qarşı dua edərik*

Əlimizdə olmayan səbəblərdən başımıza müxtəlif qəzalar gəlmiş və ya gələ bilər. Bu qəza və fəlakətlər gücümüzün çatmayacağı qədər böyük ola bilər. Qəza və fəlakətlərin baş verməməsi üçün maddi və mənəvi olaraq hər cür tədbiri almalıyıq. Alacağımız mənəvi tədbirlərin başında uca Rəbbimizə dua etmək, bizi hər cür bəlalardan qorumasını diləmək gəlir.

"Allahım, göylərdəki və yer üzündəki hər şeyin sahibi sənsən! Zəlzələ, sel, qasırğa, yanğın, yol qəzası kimi fəlakətlərdən sənə sığınırıq, bizi qoru! Başımıza bir qəza gələrsə, ondan az bir zərərlə xilas olmağımızı təmin et. Çəkdiyimiz sıxıntıları bizə savab olaraq yaz!" - kimi cümlələrlə hər şeyə gücü yetən Rəbbimizə dua edib ona pənah aparmalıyıq.

## *Peşman olsaq da ediləcək bir şey var*



Hər bir insan səhv edə bilər. Xətalı davranışımızla başqalarını incitmiş ola bilərik. Belə zamanlarda qarşımızdakı adamdan üzr istəməyə səhlənkarlıq etməməliyik. Həmçinin, bir daha o xətanı təkrarlamayacağımıza dair özümüzə söz verməliyik. Bu sözün ən gözəli səmimi olaraq Rəbbimizə verdiyimiz sözdür. Beləliklə peşmançılıqlarımızı bir dua olaraq dilə gətirə bilərik.

"Allahım, xəta işlədim, amma indi peşman oldum, məni bağışla, özümə və insanlara zərər verəcək pis düşüncə və davranışlardan məni qoru! Yaxşı, faydalı, sevimli və dürüst bir insan olmağı mənə nəsib et!" - deyə uca Rəbbimizə yalvarıb dua edə bilərik.

## *Ev sahibinə ən gözəl hədiyyə*

Bir yerə qonaq getdiyiniz zaman ən çox nəyə sevinərsiniz? Çeşidli yeməklərəmi, yeni tanışlaramı, yoxsa ananızın sizə qarşı daha mülayim davranmasınamı? Bəlkə də xoşunuza gələn tamam başqa şeylər vardır. Hər halda qonaq getməkdən xoşumuz gəlir. Bizi yaxşı qarşıladığı üçün ev sahibinə təşəkkür edərik. Ev sahibi bilsə də, bilməsə də ona dua ilə təşəkkür edə bilərik. Çünki dua ən gözəl təşəkkürdür.

“Allahım, ev sahibi bizə xoş davrandığı kimi, sən də ona xoş davran, bol nemət ver və ruzisini artır. Ona rəhm et. Bizə də qonaq gəldiyi zaman ona yaxşı davranmağı nəsib et!” deyə dua edə bilərik.

## *Sevincimizə sevinc qatan dualar*

Həyatda xəstə və sıxıntılı anlarımız olduğu kimi, sevincli və xoşbəxt zamanlarımız da vardır. Dua yalnız sıxıntılı zamanlarımızda Allahdan yardım istəmək deyildir. Əksinə, hər vaxt Rəbbimizi anmaq və xoşbəxt anlarımızda da onu xatırlamaqdır. Elə isə sevincli və xoşbəxt olduğumuz zamanlarda dua etməyi unutmayaq.



“Ey uca Allahım, sevincimi, xoşbəxtlik və səadətimi daim eylə! Sevinc və xoşbəxtliklə səni unutmayan və həddi aşmayan insanlardan eylə! Məni sev, sevən və sevilən insanlardan olmağı nəsib et, sevincimi kədərə çevirmə!” deyə dua edə bilərik.

## *Rahatlıq verən dualar*

Ey uca Rəbbim, mənə verdiyin hər bir nemət üçün sənə sonsuz həmd olsun! Çox sevdiyin əziz Peyğəmbərimizə salətu-salam olsun!

Allahım, məni sev və Peyğəmbərini sevən, Sənə və Peyğəmbərinə itaət edən insan eylə! Bütün günlərimi yaxşılıq və gözəlliklərlə doldur. Dünya və axirətdəki hər cür xeyri, gözəllik və nemətləri Səndən istər, hər cür pislikdən Sənə sığınıram.



Ey aləmlərin Rəbbi olan Allahım! Yalnız Sənə ibadət edər, yalnız Səndən kömək istəyirəm. Sənin hər şeyə gücün çatar. Sən açıqdan və gizlindən etdiyim hər şeyi bilirsən. Mənə mərhəmət et, qəlbimi mərhəmət və sevgi ilə doldur. Tənbəllikdən, boş yerə zaman keçirməkdən, nizam-intizamsız çalışmaqdan, müvəffəqiyyətsizlikdən, insanlara, ətrafımdakılara və özümə zərər verməkdən sənə sığınıram!

Allahım! İmanımı qüvvətləndir, gözəl əməllərimi artır və əxlaqımı gözəlləşdir. Qəbul olunmayacaq duadan sənə sığınıram. Sevimli Peyğəmbərimin istədiklərini səndən istəyir, sığındıqlarından da sənə sığınıram.

Allahım! Gördüyüm işlərin yanlış anlaşılmasından və haqsızlığa uğramaqdan, haqsızlıq etməkdən sənə sığınıram. Çalışmalarımın nəticəsini xeyirli eylə! Çalışmalarımın xeyirli şəkildə davam etməsini nəsib et! Məni ailəmə, ölkəmə və insanlara faydalı insan et. Bizi dünyada və axirətdə ən gözəl nemətlərinlə sevindir!

Allahım! Qəlbimi hər cür pisliklərdən qoru. Qəlbimdə qorxulara, qüssələrə və bəyənmədiyin xasiyyətlərə yer vermə! Məni yalnız özünü düşünən, öz dərdlərini böyüdüb digər insanlarla maraqlanmayan eqoist insan olmaqdan qoru! Bizi comərd və səxavətli bəndələrindən eylə!

Allahım, Sən əfv edənsən, əfv etməyi sevirsən. Günahlarımı, qüsurlarımı və bütün möminlərin günahlarını bağışla.

Ey uca Rəbbim! Məni sevdiyin bəndələrindən eylə! İşlərimi asanlaşdır, həyatımı gözəlləşdir. Məni arxasından yaxşılıq və xeyirlərlə anılan insanlardan eylə. Sevmədiyin hər halı məndən uzaqlaşdır. Məni həyatım, əməllərim və sözlərimlə Səni və İslamı gözəl anladan insanlardan eylə!

Allahım, işlərimi asanlaşdır! Ən gözəl adlar sənindir. O adlarınla Sənə yalvarıram. Ömrümə və işlərimə bərəkət ver. Sahib olduğum nemətlərin fərqinə varmağı, onlar üçün şükür etməyi və onları boş yerə sərf etməməyi, israf etməməyi mənə nəsib et!

Allahım, məni faydasız işlərə və boş əyləncələrə dalaraq vəzifələrini, ibadətlərini unudanlardan etmə! Dilimi daima doğru sözlü et. Məni hər cür xəta-baladan, qəza və fəlakətdən qoru!



Dua sevgi ce yaxınlıqdır
Dua həyatımıza gözelliklər bəxş edər
Sevincimizə sevinc əlavə edər
Yolumuzu aydınladar
Allah dua etməyimizi istəyir
O, dualarımızı eşidir
Dualarımıza cavab verir
Elə isə dua edək

ISBN 975194059-1




DUALARIMI ÖĞRENİYORUM
(Azerbaycan Türkçesi)

Diyanət İşləri Başqanlığının hədiyyəsidir. Satmaq olmaz.